"Azərbaycan Dövlət Pedaqoji Universitetinin mətbu orqanı"

# GƏNC MÜƏLLİM QƏZETİ



H.Əliyev

**"Müəllimlər müəllimi olmaq ikiqat şərəfli və eyni zamanda, ikiqat məsuliyyətli işdir!"**






**Azərbaycan bir ildən az müddət əvvəl beynəlxalq ictimaiyyətin yekdil dəstəyi ilə COP29-a ev sahibliyi etməkdən şərəf duydu.**

Müddətin qısa olmasına baxmayaraq, Azərbaycan COP-un rahat və yüksək səviyyədə keçirilməsi üçün bütün lazımi hazırlıqları həyata keçirməyə nail oldu. Mübaliğəsiz deyə bilərik ki, Bakı COP tədbiri ən möhtəşəm COP-lardən biri kimi tarixə düşəcək.

Biz 80 dövlət və hökumət başçısının, qeydiyyatdan keçmiş 76 mindən çox iştirakçının qatıldığı COP29-un çox yaxşı təşkil olunması ilə bağlı bütün qonaqlardan yüksək qiymət almaqdan qürur duyuruq.

Genişmiqyaslı və planlaşdırılmış böhtan və qarayaxma kampaniyasına baxmayaraq, Azərbaycan iqlim danışıqlarında tarixi nəticələr əldə etməyə müvəffəq oldu.

"Yaşıl dünya naminə həmrəylik" şüarını rəhbər tutan Azərbaycan bitərəf vasitəçi kimi çıxış edərək danışıqların qərəzsiz aparılması üçün bütün imkanları yaratdı. Bütün proses boyu biz inkişaf etməkdə olan ölkələrin, xüsusilə kiçik ada dövlətlərinin və ən az inkişaf etmiş dövlətlərin ehtiyaclarını nəzərə alan nəticə əldə etməyə çağırış etdik, çünki onlar iqlim dəyişmələrinin ağır yükünü daşıyırlar və ekzistensial təhlükə ilə üzləşirlər. Biz, həmçinin müstəmləkə idarəçiliyi ilə daha da ağırlaşan ekoloji problemlərdən əziyyət çəkən xalqlar və regionlar ilə həmrəylik nümayiş etdirdik.

Azərbaycan inkişaf etmiş və inkişaf etməkdə olan ölkələr arasında körpülərin qurulması üçün səylərini əsirgəmədi və bunun nəticəsində dünya tarixi Bakı nailiyyətinə şahid oldu.

Bakı COP-da İtki və Zərər Fondu tam işlək vəziyyətə gətirildi. Biz, həmçinin karbon bazarına dair çoxdan gözlənilən 6-cı maddənin tam işlək vəziyyətə gətirilməsinə nail olduq.

Ən əsası, Bakı COP 2035-ci ilə qədər inkişaf etməkdə olan ölkələrə 300 milyard ABŞ dolları təmin etmək üçün qarşıya yeni qlobal məqsəd qoyan Yeni Kollektiv Kəmiyyət Məqsədinin (NCQG) şahidi oldu. Bu razılaşma inkişaf etməkdə olan ölkələrə iqlim dəyişmələrinin fəsadları ilə mübarizədə kömək edəcək.

Mən Bakı nailiyyətini çoxtərəfliliyin təntənəsi kimi qiymətləndirirəm. COP29 iqlim diplomatiyasında dönüş nöqtəsidir və mən inanıram ki, bu irs gələcək qlobal iqlim fəaliyyətinə müsbət təsir göstərəcək. Mən COP29-a gedən yolda Azərbaycana göstərdikləri dəstəyə görə bütün Tərəflərə, Birləşmiş Millətlər Təşkilatına və UNFCCC-yə minnətdarlığımı bildirirəm.







## 31 Dekabr – Dünya Azərbaycanlılarının Həmrəyliyi Günü və Yeni il bayramı münasibətilə Azərbaycan Dövlət Pedaqoji Universitetinin rektoru professor Cəfər Cəfərovun TƏBRİKİ

**Hörmətli həmkarlar, əziz tələbələr!**

31 Dekabr - Dünya Azərbaycanlılarının Həmrəyliyi Günü və Yeni il münasibətilə sizi səmimi-qəlbdən təbrik edir, hər birinizə möhkəm cansağlığı, təhsil və elmi-pedaqoji fəaliy-yəti-nizdə uğurlar arzulayıram. Geridə qoyduğumuz 2024-cü il ölkəmiz, xalqımız və universitetimiz üçün son dərəcə əlamətdar və zəngin bir dövr kimi tarixə qovuşdu.

Ötən il həyata keçirilmiş lokal antiterror tədbirləri nəticəsində Qarabağ bölgəsində Azərbaycanın suverenliyinin tam bərpa olunmasının ildönümündə - 2024-cü ilin 20 sentyabrında Dövlət Suverenliyi Gününün təsis olunması ilə dövlətçilik tariximizdə xüsusi bir mərhələnin başlanğıcı qoyuldu. Bu tarixi gün Qarabağ Universitetinin açılışı ilə üst-üstə düşərək həm də Azərbaycanın elm və təhsil sahəsində yüksək hədəflərinə sadiqliyini göstərdi.

Yola saldığımız ildə dövlətimizin siyasətində prioritet təşkil edən Qarabağ və Şərqi Zəngəzurda bərpa-tikinti və quruculuq işlərinin vüsəti artmış, keçmiş köçkünlərin doğma yurdlarına qayıdışı uğurla davam etdirilmişdir.

Prezident İlham Əliyevin müvafiq Sərəncamı ilə 2024-cü ilin "Yaşıl dünya naminə həmrəylik ili" elan edilməsi də ötən ilin mühüm hadisələrindən biri kimi yadda qalmışdır. Belə ki, bu strateji qərar Azərbaycanın həm milli, həm də beynəlxalq miqyasda dayanıqlı inkişaf prinsiplərinə olan qətiyyətli bağlılığını nümayiş etdirdi. Prezident İlham Əliyevin rəhbərliyi ilə ölkəmiz təbii sərvətlərin və ətraf mühitin davamlı qorunması sahəsində əhəmiyyətli irəliləyişlərə imza atır. Cari ilin 11-23 noyabr tarixlərində Bakıda keçirilmiş COP29 - BMT-nin İqlim Dəyişmələri üzrə Çərçivə Konvensiyasının Tərəflər Konfransının 29-cu sessi-ya-sı ölkəmizin beynəlxalq aləmdə lider mövqeyini bir daha təsdiqləmiş, Azərbaycanın qlobal iqlim dəyişikliyi ilə mübarizədəki fəallığını beynəlxalq arenada əyani şəkildə sübut etmişdir. Bu mühüm hadisə yalnız ətraf mühitin qorunması ilə ilə məhdudlaşmamış, eyni zamanda dövlətimizin beynəlxalq aləmdəki mövqelərini daha da möhkəmləndirmiş, nüfuzunu artırmışdır. Azərbaycan COP29-un keçirilməsindəki təşəbbüskarlığı və yüksək təşkilati qabiliyyəti ilə dünya ölkələrinə örnək olmuşdur.

**Əziz həmkarlar və tələbələr!**

2024-cü il ADPU üçün bir sıra nailiyyətlərlə əlamətdar oldu. 2024/2025-ci tədris ili üçün ali təhsil müəssisələrinin bakalavriat səviyyəsinə tələbə qəbulunun I turunun nəticələrinə əsasən Pedaqoji Universitetdə 2655 mövcud plan yerindən 2626-sı (99 %) tutulub. Tələbələrin 59,06 faizi dövlət sifarişi əsasında qəbul olunub. Müqayisə üçün qeyd edə bilərik ki, universitetin ötən il üzrə plan yerlərinin 96.42%-i dolmuşdu. 2024/2025-ci tədris ilində ADPU-nun bakalavriat və magistratura səviyyələrində yeni ixtisaslara ilk dəfə qəbul aparılmışdır. Cari tədris ili üzrə 600 baldan yuxarı bal toplayan 13 nəfər ADPU və onun filiallarını seçib. Həmçinin qeyd etməliyəm ki, beynəlxalq idman yarışlarında uğurlu nəticə göstərən 6 nəfər universitetimizin Fiziki tərbiyə və çağırışaqədərki hazırlıq müəllimliyi ixtisasına qəbul olunub. Bütün bu artan dinamikalı statistika universitetimizdə və ümumilikdə ölkədə aparılan uğurlu təhsil islahatlarının məntiqi nəticəsidir.

Pedaqoji Universitetdə tədris keyfiyyətinin artırılması və əmək bazarının tələblərinə uyğun müasir mütəxəssislərin hazırlanması sahəsində cari ildə də bir sıra vacib addımlar atılmışdır. Universitetin beynəlxalq əməkdaşlığının genişləndirilməsi istiqamətində mühüm tədbirlər həyata keçirilmiş, bir çox nüfuzlu universitetlərlə qarşılıqlı əməkdaşlıq müqavilələri imzalanmışdır. 2024-cü ildə Corc Vaşinqton Universiteti ilə birgə həyata keçirilən magistr ikili diplom proqramı çərçivəsində üçüncü məzun buraxılışı baş tutdu. Bu əməkdaşlığın daha da möhkəmləndirilməsi və proqramın davam etdirilməsi məqsədilə Niyyət Bəyannaməsi imzalandı. Vahid tələbə kartı ilə bağlı Təhsilin İnkişafı Fondu ilə imzalanmış müqavilə isə tələbələrimiz üçün müasir və inteqrasiya olunmuş xidmətlər təqdim edir. ADPU-nun Strateji İnkişaf Mərkəzi tərəfindən "Məktəb liderliyi" və "Məktəbəqədər təhsildə liderlik" proqramları müvəffəqiyyətlə həyata keçirilir. Eyni zamanda, istedadlı tələbələrin aşkarlanması və dəstəklənməsi, onların təhsil sahəsində liderlik qabiliyyətlərini inkişaf etdirməsi məqsədilə "Pedaqoji Universitetin Gələcək Təhsil Liderləri" müsabiqəsinin mentorluq proqramı uğurla davam edir. Bunlardan əlavə, il ərzində həm tədrisin məzmun keyfiy-yətinin artırılması, həm də tələbələrin ictimai-sosial fəallığının təmin edilməsi istiqamətində çoxsaylı layihə və tədbirlər uğurla icra edilib. `

**Əziz həmkarlar və tələbələr!**

2024-cü ilin nailiyyətləri 2025-ci ildə üzərimizə daha böyük məsuliyyətlər qoyur. Biz və gələcəyin müəllimləri, ixtisaslı mütəxəssisləri kimi böyük ümid bəslədiyimiz hazırkı tələbələr yeni ildə yeni təhsil uğurları üçün birgə səylərimizi gücləndirməli, yorulmadan çalışmalıyıq. Prezident İlham Əliyev Qarabağ Universitetinin açılışındakı nitqində gənclərimizin vətənpərvərlik ruhunda tərbiyə olunmasında müəllimlərin böyük rolunu xüsusi vurğulamışdır. Gələcəkdə bu şərəfli missiyanı uğurla yerinə yetirməyə hazırlaşan gənc müəllimlər yaxşı təhsil almaqla yanaşı, vətənpərvərlik hissini daim gücləndirməlidirlər. Günümüzün bu vacib tələblərini təhsil prosesində ön planda tutaraq, gənclərimizin həm bilikli, həm də milli-mənəvi dəyərlərə malik vətəndaşlar kimi yetişməsinə böyük töhfələr verəcəyinizə əminəm.

Qeyd etməliyəm ki, ilin son günü həm də mənəvi birlik və həmrəyliyimizin, milli şüurun oyanışının təcəssümü kimi tarixə düşüb.

Yeni ildə milli birliyimizi qoruyaraq daha böyük nailiyyətlərə imza atacağımıza inanıram. Bir daha bütün həmkarlarımızı, tələbə və məzunlarımızı ürəkdən təbrik edir, sizə uğur, xoşbəxtlik və firavanlıq dolu günlər arzulayıram.

Bayramlarınız mübarək olsun!

*1921-ci ildən təhsilimizin keşiyində . . .*

Qəzet 1958-ci il, fevral ayının 1-dən etibarən nəşr olunur. | Dekabr 2024 / № 4 (1129)

## Tələbələrinin 72 faizi ixtisas seçimində ilk üç yerdə Pedaqoji Universiteti qeyd ediblər



Dekabrın 17-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Elmi Şurasının iclası keçirilib.

İclasda açılış nitqi ilə çıxış edən ADPU-nun rektoru professor Cəfər Cəfərov ötən dövr ərzində görülən işlər və baş verən yeniliklərə toxunaraq yaxınlaşmaqda olan yeni təqvim ilində müxtəlif istiqamətlər üzrə daha da səmərəli fəaliyyət göstərməyin vacibliyini vurğulayıb. Rektor qeyd edib ki, əlaqədar strukturlarda, müvafiq kafedralarda aparılan elmi-tədqiqat işlərinin səviyyəsinin yüksəldilməsi, eləcə də bu kontekstdə müvafiq stimullaşdırma tədbirləri olduqca əhəmiyyətlidir. Daha sonra universitetdə uzunmüddətli səmərəli elmi-pedaqoji fəaliyyətinə və yubiley yaşına görə Biologiya və onun tədrisi texnologiyası kafedrasının müdiri dosent Anaxanım Yusifovaya Fəxri Fərmanı təqdim olunub. Eləcə də elmi dərəcə almış əməkdaşlara fəlsəfə doktoru diplomları təqdim olunub. Elmi Şuranın gündəliyinə uyğun olaraq tədris işləri üzrə prorektor dosent Eldar Aslanov "ADPU-nun 2024/2025-ci tədris ilinin payız semestrinin imtahan sessiyasına hazırlığının vəziyyəti və qarşıda duran vəzifələr" mövzusunda məruzə ilə çıxış edib. Məruzədə qeyd olunub ki, Pedaqoji Universitetdə müvafiq semestr imtahanlarının 06 yanvar-03 fevral 2025-ci il tarixlərində tərtib olunmuş cədvəl üzrə keçirilməsi nəzərdə tutulur. Ümumilikdə universitetin Bakı şəhəri üzrə 11250-dək tələbə və magistrantının iştirak edəcəkləti imtahanların ADPU-nun Səbail və Gənclik tədris binalarında (xüsusi qabiliyyət tələb edən fənlər isə Nəsimi tədris binası) gündə üç növbədə keçirilməsi planlaşdırılır.

2023/2024-cü tədris ilinin yaz semestrinin imtahan sessiyasının təşkili ilə əlaqədar ADPU, onun filialları və Pedaqoji Kollecin ümumilikdə 3654 nəfər tələbəsi arasında keçirilmiş sorğunun nəticələrinə əsasən, respondentlərin 72 faizindən çoxu imtahanlarda 71 baldan yüksək, 26,4 faizi isə 91 baldan yüksək nəticə göstəriblər. İştirakçıların 80 faizə qədəri imtahanların şəffaflığını 10 ballıq sistem üzrə 7-10 bal aralığında, 45 faizə qədəri isə 9-10 bal aralığında qiymətləndiriblər. Onlardan 81 faizə qədəri imtahanla bağlı apellyasiyaya müraciət etməyiblər. Tələbələrin 35 faizindən çoxu imtahan dönəmində ADPU-da fəaliyyət göstərən psixoloji xidmətdən yararlanıb. 88 faiz iştirakçı imtahan nəzarətçilərinin davranışından razı olduğunu qeyd edib. Ümumi rəyə əsasən, tələbələr şifahi imtahan formasını daha çox dəstəkləyirlər.

2024/2025-ci tədris ilində Pedaqoji Universitetə qəbul olan tələbələr arasında aparılan sorğunun nəticələri haqqında məlumat verən prorektor E.Aslanov qeyd edib ki, 423 nəfər I tədris ili tələbəsini iştirak etdiyi sorğunun nəticələrinə əsasən, respondentlərin 70.4 faizi müəllim olmaq üçün, 16.5 faizi isə rahat təhsil mühitinə görə ADPU-nu seçiblər. İştirakçıların 72 faizi ixtisas seçimində ADPU-nu ilk 3 yerdə qeyd etdiklərini, 92.4 faizi isə ilk turdan ADPU-ya qəbul olduqlarını vurğulayıblar. Tələbələrin 83 faizindən çoxu məzun olduqdan sonra müəllim kimi fəaliyyət göstərəcəklərini qeyd ediblər. Həmçinin, sorğu iştirakçılarının 90 faizi universitetdə xarici dil seçimində ingilis dilinə üstünlük veriblər.

Sorğuya qatılanların 63 faizi Pedaqoji Universitet haqqında ilk məlumatı ADPU-nun sosial media hesabları və rəsmi saytından, 18.7 faizi universitetin tələbələrindən, 14.4 faizi isə məzunlarından əldə etdiklərini bildirib.

Daha sonra cari məsələlər müzakirə olunub. Müzakirələrdə elm və innovasiyalar üzrə prorektor professor Asəf Zamanov Filologiya fakültəsinin dekanı, f.ü.f.d. Könül Nəriman qızı Həsənovaya dosent elmi adının verilməsi üçün AAK qarşısında vəsatət qaldırılması, tədris işləri üzrə prorektor dosent Eldar Aslanov dərs vəsaitlərinin nəşrinə icazə verilməsi və SABAH qruplarında tədris planının seçmə fənlər blokuna "Davamlı inkişaf məqsədləri" fənninin əlavə edilməsi, rektorun müşaviri Ümid Mehdiyev isə Ağcabədi filialının ştat cədvəli və struktur vahidlərinin təsdiqi barədə məruzə ediblər.

Yekunda məruzələr ətrafında fikir mübadiləsi aparılıb, Şura tərəfindən təqdim olunan hesabatlar qəbul edilib, müvafiq təkliflər barədə müsbət qərarlar verilib.

## ADPU X Bakı Beynəlxalq Kitab Sərgisində




Azərbaycan Respublikası Mədəniyyət Nazirliyinin təşkilatçılığı ilə Bakı Ekspo Mərkəzində X Bakı Beynəlxalq Kitab Sərgisi keçirilib.
Sərgidə ölkənin tanınmış ali məktəbləri, nəşriyyatlar, kitabın təbliği ilə məşğul olan qurumlar, eləcə də çoxsaylı xarici ölkələrin müvafiq qurum və nəşriyyatları iştirak ediblər.

Azərbaycan Dövlət Pedaqoji Universitetini (ADPU) sərgidə Kitabxana-İnformasiya Mərkəzi təmsil edib.

Mərkəzin direktoru Zinharə Həsənova bildirib ki, məqsəd Pedaqoji Universitet alimlərinin tədqiqatlarını və əsərlərini təbliğ etməkdir: "Bu əsərlər Azərbaycanın elmi-mədəni ictimaiyyəti üçün çox əhəmiyyətlidir".

Qeyd edək ki, Pedaqoji Universitetin stendində Ümumilli Lider Heydər Əliyevin həyat və fəaliyyətini əks etdirən nəşrlər, ADPU-nun 100 illik yubileyi ilə bağlı nəşr olunmuş silsilə kitablarla yanaşı professor-müəllim heyətinin müəllifləri olduqları monoqrafiya, dərslik, dərs vəsaitləri və tədqiqat əsərləri, həmçinin universitetin dövri-elmi nəşrləri də nümayiş etdirilib.

Sərginin ilk günündə universitetin stendini ziyarət edən ADPU-nun rektoru professor Cəfər Cəfərov xüsusən ali təhsil müəssisələrinin əməkdaşlarının əsərlərinin təbliğ olunması baxımından bu kimi platformaların önəmini vurğulayaraq, hər il keçirilən Bakı Beynəlxalq Kitab Sərgisinin ümumilikdə regionun mədəni həyatında mühüm rol oynadığını qeyd edib. Oktyabrın 8-dək davam edən sərgidə ziyarətçilər Pedaqoji Universitetin stendinə yaxınlaşaraq universitetin nəşrləri və elmi-pedaqoji potensialla bağlı ətraflı məlumat alıblar.

## 40 il sonra yenidən doğma universitetdə



Oktyabrın 3-də ADPU-da Fizika fakültəsinin 1984-cü il məzunları ilə görüş keçirilib.

Tədris departamentinin Məzun koordinasiya və karyera şöbəsinin müdiri Könül Əsgərova, Fizika fakültəsinin dekan müavini dosent Xankişi Məmmədov və Ümumi fizika kafedrasının müdiri professor Cahangir Hüseynov məzunları qarşılayıblar. K.Əsgərova onları 40 il sonra məzunu olduqları universitetdə görməkdən şad olduğunu bildirərək, məzunlara universitetdə təhsilin məzmununda, eləcə də infrastruktur və maddi-texniki bazada həyata keçirilən yeniləmələr barədə məlumat verib. Çıxış edən ADPU-nun məzunu, 279 nömrəli məktəbin direktoru Südabə Abdullayeva tələbəlik illərinin xoş xatirələrindən danışıb. Həmçinin, S.Abdullayeva rəhbərlik etdiyi müəssisənin Pedaqoji Universitetlə sıx əməkdaşlıq etdiyini vurğulayıb. Sonda məzunlar universitetlə tanış olublar, xatirə şəkli çəkdirilib.

## ADPU-da "Azərbaycan müəllimi"nin 90 illiyi qeyd olundu



Oktyabrın 4-də Pedaqoji Universitetdə 5 Oktyabr – Beynəlxalq Müəllimlər Günü və Azərbaycan Respublikası Elm və Təhsil Nazirliyinin mətbu orqanı olan "Azərbaycan müəllimi" qəzetinin 90 illik yubileyi münasibəti ilə görüş keçirilib.

Görüşdə Pedaqoji Universitetin rəhbərliyi, Elm və Təhsil Nazirliyinin İctimaiyyətlə əlaqələr və kommunikasiya şöbəsinin müdiri Səbuhi Rzayev, "Azərbaycan müəllimi" qəzetinin baş redaktoru Sərvan İbrahimov, universitetin professor-müəllim heyəti, qəzetin əməkdaşları və tələbələr iştirak ediblər. Görüşdən əvvəl qonaqlar Pedaqoji Universitetdə tələbələr üçün yaradılan şəraitlə tanış olub, dərs prosesinin gedişini izləyiblər. Giriş sözü ilə çıxış edən ADPU-nun rektoru professor Cəfər Cəfərov qeyd edib ki, elmi-pedaqoji ictimaiyyət arasında böyük nüfuza malik, öz dəst-xəti ilə seçilən "Azərbaycan müəllimi" qəzeti artıq 90 ildir ki, Azərbaycan təhsilini, müəllimini və məktəbini tərənnüm edir, pedaqoji sahədə yeni yanaşmaları, innovativ çağırışları təbliğ edir. Rektor diqqətə çatdırıb ki, qəzet daim universitet əməkdaşlarının elmi-pedaqoji fikirlərini, Pedaqoji Universitetin uğurlarını geniş ictimaiyyətə çatdıran tribuna kimi mühüm rol oynayıb, universitetlə qəzet arasında bu gün də davam edən sıx əməkdaşlıq əlaqələri qurulub. Prof. C.Cəfərov "Azərbaycan müəllimi" qəzetini yubiley münasibəti ilə təbrik edib, ADPU ilə qəzet arasında sıx əməkdaşlıq əlaqələrinin bundan sonra daha da inkişaf etdiriləcəyinə ümid etdiyini qeyd edib. Rektor, həmçinin 5 Oktyabr – Beynəlxalq Müəllimlər Günü münasibəti ilə bütün müəllimlərə və təhsil ictimaiyyətinə təbriklərini çatdırıb. Elm və Təhsil Nazirliyinin İctimaiyyətlə əlaqələr və kommunikasiya şöbəsinin müdiri Səbuhi Rzayev Pedaqoji Universitetin qəzetin yubileyi ilə bağlı təşəbbüsünü və görüşün əhəmiyyətini yüksək qiymətləndirərək "Azərbaycan müəllimi" qəzetinin Azərbaycanın təhsil həyatında önəmli yer tutduğunu qeyd edib. Vurğulanıb ki, ölkəmizin təhsil sahəsində yeganə ümumrespublika mətbu orqanı olan "Azərbaycan müəllimi" bundan sonra fəaliyyətini yenilənmiş üslubda daha da innovativ formada davam etdirib.

Çıxış edən ADPU-nun beynəlxalq əlaqələr üzrə prorektoru professor Mahirə Hüseynova bildirib ki, "Azərbaycan müəllimi" ölkə təhsil sisteminin flaqman mətbu orqanı olmaqla yanaşı, həm də fəaliyyətinin bütün dövrlərində ziyalıların, elm və mədəniyyət xadimlərinin, bütövlükdə təhsil ictimaiyyətinin etibarlı tribunası olub. M.Hüseynova qeyd edib ki, qəzet Azərbaycanın pedaqoji fikir tarixinin zəngin xəzinəsi, maarifçilik ənənə və ideyalarının əsas daşıyıcısıdır.

ADPU-nun İbtidai təhsilin pedaqojikası kafedrasının müdiri professor Fərrux Rüstəmov "Azərbaycan müəllimi və Pedaqoji Universitet" mövzusunda məruzə ilə çıxış edib. Prof. F.Rüstəmov məruzəsində qəzetin tarixi, ölkəmizdəki maarifçilik hərəkatında "Azərbaycan müəllimi"nin rolu, Pedaqoji Universitet və qəzetin üzvi bağlarından söz açıb.

"Azərbaycan müəllimi" qəzetinin baş redaktoru Sərvan İbrahimov qəzetə göstərilən diqqət və təşkil edilən görüş üçün ADPU rəhbərliyinə təşəkkürlərini bildirib, bu cür tədbirlərin təşkilinin təhsil mediasının inkişafında əhəmiyyətli olduğunu vurğulayıb. S.İbrahimov universitet və qəzet arasında uzun illərdir davam edən qarşılıqlı işgüzar əlaqələrin davamlı olacağına şübhə etmədiklərini bildirib.

Sonda qonaqlara universitetin xatirə hədiyyələri təqdim edilib, xatirə şəkli çəkilib.

## ADPU tələbələri Xalq Təhsili Muzeyinə ekskursiya ediblər



ADPU Tələbə Gənclər Təşkilatının Tarix və coğrafiya fakültəsi təşkilatının təşkilatçılığı ilə 5 Oktyabr – Beynəlxalq Müəllimlər Günü münasibətilə Elm və Təhsil Nazirliyinin Xalq Təhsili Muzeyinə ekskursiya təşkil olunub.

1932-ci ildən fəaliyyət göstərən muzeyə ekskursiya zamanı elm xadimləri, ziyalılar, maarifçilər haqqında sənəd və materiallar, müxtəlif dövrlərdə Azərbaycan təhsilinin inkişafını əks etdirən eksponatlarla yaxından tanış olan tələbələr onları maraqlandıran suallara cavab alıblar.

## Pedaqoji Universitetdə Müəllimlər Günü tədbiri: Öyrənəndən öyrədənə



ADPU Təhsil Könüllüləri Tələbə Birliyinin təşkilatçılığı ilə 5 Oktyabr – Beynəlxalq Müəllimlər Gününə həsr olunmuş "Öyrənəndən öyrədənə" adlı ədəbi-bədii tədbir keçirilib. Tədbirdə Pedaqoji Universitetin sosial və humanitar məsələlər üzrə prorektoru professor Fikrət Rzayev, professor-müəllim heyəti və tələbələr iştirak ediblər.

Azərbaycan Respublikasının Dövlət Himninin ifa olunması ilə başlayan tədbirdə tələbələrin təqdimatında "Uzundərə" və "Karnaval" rəqs kompozisiyaları təqdim olunub. Tələbələrdən Elnur Əhmədovun tarda milli ifası, Ulduz Hüseynovanın ifasında Bəxtiyar Vahabzadənin "Ağ saçlar" şeiri, eləcə də tələbələrin hazırladıqları "Dərs Prosesi-2" adlı musiqili səhnəcik olduqca maraqla qarşılanıb.

Tədbir ADPU TKTB üzvlərinin xorda ifasında "Əziz müəllimim" mahnısının səsləndirilməsi ilə yekunlaşıb.

## ADPU tələbələrindən müəllimlərinə xoş sürpriz



ADPU Tələbə Həmkarlar İttifaqı Komitəsi 5 Oktyabr – Beynəlxalq Müəllimlər Günü münasibətilə maraqlı təşəbbüs həyata keçirib.

ADPU THİK sədri Cəmilə Qurbanova və təşkilatın fəal üzvləri universitet rəhbərliyi, fakültə və struktur rəhbərləri, eyni zamanda bir sıra müəllimlərlə görüşüb, onlara peşə bayramları münasibətilə xoş arzularını çatdırıblar. Görüşlərdə ADPU THİK adından hazırlanmış hədiyyələr müəllimlərə təqdim edilib.

# Pedaqoji Universitetə yeni mətbuat katibi təyin edilib

ADPU-nun rektoru professor Cəfər Cəfərovun imzaladığı əmrə əsasən Taleh Əlizamin oğlu Mirzəyev universitetin İctimaiyyətlə əlaqələr və marketinq şöbəsinin müdiri vəzifəsinə təyin edilib.

Qeyd edək ki, T.Mirzəyev 2021-ci ildən ADPU-da çalışır. O, 2021-2024-cü illərdə İctimaiyyətlə əlaqələr və marketinq şöbəsində redaktor vəzifəsinfə fəaliyyət göstərib. 2024-cü ilin avqustundan müvafiq əmrə qədər şöbə müdiri səlahiyyətlərini icra edib.

2020-ci ildə ADPU-nun Coğrafiya müəllimliyi ixtisası üzrə bakalavr, 2022-ci ildə Coğrafiya fənninin tədrisi metodikası və metodologiyası ixtisaslaşması üzrə magistr pilləsini fərqlənmə diplomu ilə bitirən T.Mirzəyev, həmçinin ictimai sektor və könüllülük hərəkatında aktiv fəaliyyəti ilə seçilir. Müxtəlif illərdə UNEC nəzdində Sosial-İqtisad Kolleci Tələbə Gənclər Təşkilatının sədri, Azərbaycan Dövlət Pedaqoji Universiteti Tələbə Gənclər Təşkilatının sədr müavini, Azərbaycan Dövlət



Pedaqoji Universiteti Təhsil Könüllüləri Tələbə Birliyinin sədri olaraq fəaliyyət göstərib. Dövri mətbuatda şeirləri və müxtəlif yazıları ilə tanınır.

Qeyd edək ki, T.Mirzəyev I və III "Yüksəliş" müsabiqəsinin finalçısıdır.

# ADPU-nun Şəki filialında TGT-yə yeni sədr seçilib



ADPU-nun Şəki filialında Tələbə Gənclər Təşkilatının (TGT) hesabat-seçki yığıncağı keçirilib. Yığıncaqda Şəki şəhər Gənclər və İdman İdarəsinin baş mütəxəssisi Səbahət Bağırova, filialın tədris işləri üzrə direktor müavini dosent Gülarə Abdullayeva, Karyera mərkəzinin müdiri Xuraman Həmidova, müəllim və tələbələr iştirak ediblər.

Filialın TGT-sinin ötən tədris ili ərzində fəaliyyəti haqqında təşkilatın sədr müavini, Xarici dil müəllimliyi (ingilis dili üzrə) ixtisasının II tədris ili tələbəsi Elvin Xəlilov çıxış edib. Hesabatda ölkəmizdə gənclərin uğurlu inkişafı, onlara göstərilən dövlət qayğısından bəhs edən E.Xəlilov ötən müddət ərzində filialda təhsil alan gənclərin intellektual səviyyəsinin daha da inkişaf etdirilməsi, dünyagörüşünün genişləndirilməsi, asudə vaxtlarının səmərəli təşkili, onların cəmiyyətə faydalı, hərtərəfli inkişaf etmiş şəxsiyyət kimi formalaşmaları istiqamətində təşkilat tərəfindən görülən işlər, həyata keçirilən tədbirlər haqqında məlumat verərək bildirib ki, ölkə başçısının gənclərə olan inam və etimadını doğrultmaq üçün bundan sonra da var qüvvələri ilə çalışacaqlar.

Sonra hesabat ətrafında müzakirə aparılıb, çıxışlar dinlənilib. Yığıncaqda TGT-nin illik fəaliyyəti məqbul qiymətləndirilib. Açıq səsvermə yolu ilə TGT-nin İdarə Heyətinin yeni tərkibi seçilib.

Şəki şəhər Gənclər və İdman İdarəsinin baş mütəxəssisi Səbahət Bağırova çıxış edərək, filialın bütün ixtisaslarının tələbələrinin təmsil olunduğu 25 nəfərdən ibarət yeni tərkibi təbrik edib və onlara işlərində uğurlar arzulayıb.

Yığıncaq başa çatdıqdan sonra yeni seçilmiş İdarə Heyətinin iclası keçirilib. İclasda TGT-nin sədrinin seçilməsi məsələsinə baxılıb. Sədrlik üçün Riyaziyyat və informatika müəllimliyi ixtisasının IV tədris ili tələbəsi Xədicə Abdurahmanlının namizədliyi irəli sürülüb və açıq səsvermədə böyük səs çoxluğu ilə qəbul olunub.

# Pedaqoji Universitetdə ekosərgi: ATMA, YARAT





Oktyabrın 9-da Kimya və biologiya fakültəsinin təşkilatçılığı ilə tələbələrin "ATMA, YARAT! " adlı ekosərgisi və ağacəkmə aksiyası keçirilib. Sərgini giriş sözü ilə açan Kimya və biologiya fakültəsinin dekanı dosent Reyhan Ağayeva "Yaşıl dünya naminə həmrəylik ili" və COP29-a həsr olunmuş bu tədbirin dünyamızı qorumaq adına göndərilən əhəmiyyətli mesaj olduğunu qeyd edib. Prezident İlham Əliyev tərəfindən təsdiq edilmiş "Azərbaycan 2030: sosial-iqtisadi inkişafa dair Milli Prioritetlər" sənədində 5-ci prioritetin məhz "Təmiz ətraf mühit və yaşıl artım ölkəsi" olduğunu qeyd edən R.Ağayeva, yaşıl iqtisadiyyata və yaşıl enerji təchizatına keçidin Azərbaycan iqtisadiyyatının prioritet məsələlərindən olduğunu, ölkə başçısının işğaldan azad olunmuş ərazilərin yaşıl enerji zonasına çevirməsi ilə bağlı verdiyi Sərəncam və görülən işlərdən söz açıb, hər kəsi tullantılardan səmərəli istifadəyə, dünyamızı, təbiətimizi qorumağa səsləyib. Sərgi çərçivəsində fakültə tələbələrinin kağız, plastik, şüşə və digər müxtəlif tullantı materiallarından hazırladıqları, bioloji müxtəlifliyin və ətraf mühitin qorunmasının vacibliyini tərənnüm edən çeşidli rəsm əsərləri, heyvan maketləri və digər əsərlər nümayiş etdirilib. Sərgidə çıxış edən ADPU-nun rektoru professor Cəfər Cəfərov qeyd edib ki, ətraf mühitin mühafizəsi planetimizin gələcəyi üçün kritik önəm daşıyır. İqlim dəyişikliyi, ekosistemlərin pozulması və təbii sərvətlərin plansız istismarı müasir dövr insanının təbiətə qarşı məsuliyyətini daha da artırmalıdır. C.Cəfərov diqqətə çatdırıb ki, ölkəmizdə ekoloji vəziyyətin stabilləşdirilməsi, ətraf mühitin mühafizəsi və ekoloji problem yaradan məsələlərin həlli istiqamətində uğurlu hərtərəfli siyasət həyata keçirilməkdədir. Rektor qeyd edib ki, Birləşmiş Millətlər Təşkilatının İqlim Dəyişikliyi Konfransı olan COP29 kimi irimiqyaslı və məsuliyyətli tədbirin ölkəmizə həvalə edilməsi təsadüfi deyil və bu bir daha ölkəmizdə müvafiq sahədə aparılan işlərin qlobal arenada yaratdığı rəğbətin təzahürüdür. Prof. C.Cəfərov keçirilən tədbirin əhəmiyyətini yüksək qiymətləndirərək, bu tədbirin cəmiyyət üçün önəmli çağırış olduğunu qeyd edib, bu cür layihələrin davamlı olaraq keçirilməli olduğunu vurğulayaraq, tədbirin əsas təşkilatçıları olan fakültə dekanı dos. Reyhan Ağayeva və dekan müavini dos. Bəsti Əsədovaya təşəkkürünü bildirib. Daha sonra ADPU-nun baza məktəbi olan M.Rahim adına 7 saylı tam orta məktəbin şagirdlərinin təqdimatında tullantılardan hazırlanmış "National flora" adlı geyim sərgisi də nümayiş olunub. Sonda universitet rəhbərliyi və tələbələrin iştirakı ilə universitetin həyatında ağacəkmə aksiyası həyata keçirilib, tədbirin təşkilində fərqlənən tələbə və şagirdlər təltif olunub.

## ADPU-nun tələbələri və xor kollektivi universitetlərarası bədii yaradıcılıq müsabiqə-festivalının qalibi olublar



Elm və Təhsil Nazirliyi və Azərbaycan Təhsil İşçiləri Azad Həmkarlar İttifaqı Respublika Komitəsinin birgə təşkilatçılığı ilə ali təhsil müəssisələrinin tələbələri arasında keçirilən, Ümummilli Lider Heydər Əliyevin anadan olmasının 101-ci ildönümünə həsr olunmuş tələbələrin bədii yaradıcılıq müsabiqə-festivalının qaliblərinin mükafatlandırılma mərasimi keçirilib.

26 ali təhsil müəssisəsinin tələbələri arasında keçirilən müsabiqə-festivalında mükafata layiq görülənlər arasında Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) xor kollektivi və ADPU Tələbə Həmkarlar İttifaqı Komitəsinin (ADPU THİK) fəal üzvləri də yer alıb.

Müsabiqə-festivalda Pedaqoji Universitetin xor kollektivi müvafiq nominasiya üzrə II yerə layiq görülüb. Filologiya fakültəsinin tələbəsi Aytac Muradlı "Bədii qiraət (klassik)" nominasiyasında, Riyaziyyat fakültəsinin tələbəsi Dilarə Abdullazadə isə "Vokal (müasir)" nominasiyasında I yer tutublar. İncəsənət və fiziki tərbiyə fakültəsinin tələbəsi, II Qarabağ müharibəsi qazisi Afiq Əsədov "Aşıq musiqisi" nominasiyasında II yerə layiq görülüb.

## ADPU-nun prorektoru Helsinki şəhərində işgüzar səfərdə olub



Pedaqoji Universitetin strateji inkişaf məsələləri üzrə prorektoru Könül Pirverdiyeva ötən ay Finlandiyanın Helsinki şəhərində keçirilən "Regional həmkarlarla tədris mükəmməlliyi üzrə öyrənmə seminarı – Təhsilverənlərin təkmilləşdirilməsi" adlı seminarda iştirak edib. Tədbir Finlandiyanın Təhsil və Mədəniyyət Nazirliyi, Estoniyanın Təhsil və Tədqiqat Nazirliyi və Avropa Təlim Fondu (ATF) tərəfindən Şərq Tərəfdaşlığı proqramı çərçivəsində birgə təşkil olunub.

Şərq Tərəfdaşlığı proqramına üzv olan ölkələrin təhsil sistemlərinin nümayəndələrinin iştirak etdiyi 5 günlük tədbirdə iştirakçılar müxtəlif təhsil pillələri üzrə müəllim hazırlığı sahəsində Finlandiya və Estoniya təcrübələri ilə yaxından tanış olmuş, ümumtəhsil, peşə və ali təhsil müəssisələrinə sahə səfərlərində iştirak edərək müəssisələrin akademik və inzibati heyəti ilə müzakirələr aparmışlar.

Seminar çərçivəsində müəllimlərin işə qəbulu və karyera yolları, Finlandiya və Estoniya təcrübəsi əsasında müəllim peşəsinin cazibədarlığının artırılması strategiyaları, bu təcrübələrin Şərq Tərəfdaşlığı ölkələrinə tətbiqi yolları müzakirə olunub.

Eyni zamanda seminarda müasir rəqəmsal tədris vasitələrindən istifadə etməklə davamlı təlim və müəllimlərin peşəkar inkişafı sahəsində innovativ yanaşmalar təqdim edilib, tədris mükəmməlliyinin artırılması üçün müasir təhsil ehtiyaclarına uyğunlaşdırılmış kurikulum və pedaqoji yanaşmalar müzakirə edilib.

Həmçinin səfər çərçivəsində Estoniyanın Təhsil və Tədqiqat Nazirliyi, Tallin Universiteti, Finlandiyanın Milli Təhsil Agentliyi (EDUFI), Finlandiya Təhsil Qiymətləndirmə Mərkəzi (FINEEC), Təhsil İşçiləri Həmkarlar İttifaqı (OAJ), Viikki Müəllim Hazırlığı Məktəbi, Helsinki Elmlər və Məktublar Evi ziyarət olunub, müxtəlif istiqamətlər üzrə görüşlər keçirilib.

## "Dentons Global Advisors" şirkətinin nümayəndələri ADPU-da olublar



Oktyabr 9-da universitetdə "Dentons Global Advisors" şirkətinin nümayəndələri ilə görüş keçirilib. Görüşdə ADPU-nun rektoru professor Cəfər Cəfərov, Tədris departamentinin direktoru dosent Sənan Əliyev, Beynəlxalq əlaqələr şöbəsinin müdiri Günay Məhərrəmova, Xarici Dillər Mərkəzinin baş müəllimləri Yasəmən Babayeva və Aytən İbrahimova, eləcə də "Dentons Global Advisors" şirkətinin Təhsil və İşçi Qüvvəsi təcrübəsinin rəhbəri Conatan Kaplan, Turhan Səttarov və Asif Cahangir iştirak ediblər.

Görüşün əsas məqsədi ölkədə müəllim hazırlığı prosesinin inkişaf etdirilməsi və təkmilləşdirilməsi istiqamətində fikir mübadiləsinin aparılması olub. Tərəflər, təhsilin inkişafı və yüksək səviyyəli müəllim hazırlığı proqramlarının təmin edilməsi sahəsində əməkdaşlığın zəruriliyini vurğulayıblar.

## ADPU-nun prorektoru Ərəbgir şəhərinin fəxri vətəndaşı seçilib



Türkiyə Respublikasının Ərəbgir ilçəsində təşkil olunan IV Beynəlxalq Oğuzlar Simpoziumunda iştirak edən Pedaqoji Universitetin beynəlxalq əlaqələr üzrə prorektoru, filologiya elmlər doktoru, professor Mahirə Hüseynova Ərəbgir şəhərinin fəxri vətəndaşı seçilib. Professor Mahirə Hüseynovaya bununla bağlı təqdim edilən sənəddə yazılır: "Ərəbgirin ölkə və beynəlxalq səviyyədə təbliğində öz töhfəsini, iştirakını və dəstəyini əsirgəməyən, bu işdə böyük fədakarlıqla çalışan ADPU-nun prorektoru prof. Mahirə Hüseynovaya Ərəbgir rayonunun vətəndaşlığı haqqında arayış təqdim olunub. Ərəbgir Bələdiyyəsinin sədri Haluk Cömərdoğlu". Qeyd edək ki, Beynəlxalq Oğuzlar Simpoziumu türk xalqlarının vahid müstəviyə inteqrasiyası üçün türk dövlətlərində ildə bir dəfə nüfuzlu universitetlər tərəfindən keçirilən tədbirdir. Araşdırmaçı alimlərin bölmə iclaslarında elmi məqalələri ilə çıxışları və bu çərçivədə müzakirələri nüfuzlu elmi nəşrlərdə dərc olunur.

## Quba filialında "Yaşıl dünya naminə həmrəylik ili"nə həsr olunmuş beynəlxalq elmi konfrans keçirilib



Oktyabrın 11-də ADPU-nun Quba filialının ev sahibliyi ilə "Yaşıl dünya naminə həmrəylik ili"nə həsr olunmuş "Regionlarda ali təhsil: reallıqlar və perspektivlər" mövzusunda IV Beynəlxalq elmi konfransın açılışı olub.

Beynəlxalq konfrans Azərbaycan Respublikasının elm və təhsil naziri Emin Əmrullayevin müvafiq əmri əsasında ADPU və onun Quba filialının birgə təşkilatçılığı ilə keçirilib.

Əvvəlcə konfransın iştirakçılarından ibarət nümayəndə heyət Ümummilli Lider Heydər Əliyevin Qubadakı heykəli önünə tər çiçəklər düzüb, aziz xatirəsinə ehtiram göstəriblər.

Konfrans Azərbaycan Respublikasının Dövlət Himninin səsləndirilməsi ilə başlanıb. Sonra Ulu Öndər Heydər Əliyevin və Azərbaycanın bütövlüyü uğrunda canlarını fəda edən qəhrəman şəhidlərimizin əziz xatirəsi bir dəqiqəlik sükutla yad edilib. Daha sonra ADPU-nun Quba filialının fəaliyyətindəki uğur və nailiyyətləri, o cümlədən mövzuya dair əvvəlki konfransların çağırışlarını özündə ehtiva edən film nümayiş olunub. Rəsmi hissə, bədii proqram və 3 paneldən ibarət olan, iki gün davam edən konfrans çox sayda yerli və xarici təhsil müəssisələrinin təşkilati dəstəyi ilə həyata keçirilir. Tərəflər təşkilati prosesdə gündəlikdə olan mövzuya xüsusi həssaslıqla yanaşdıqlarını ifadə ediblər. BMT-nin İqlim Dəyişikliyi üzrə Çərçivə Konvensiyasının Tərəflər Konfransının 29-cu sessiyası – COP29 beynəlxalq tədbirinə böyük səylə ev sahibliyinə hazırlaşan Azərbaycan bu istiqamətdə ölkənin elm və təhsil ictimaiyyəti qarşısında da təxirəsalınmaz vəzifələr qoyub. Başqa sözlə, Azərbaycan dövlətinin məqsədyönlü COP29 siyasətinin ölkənin elm və təhsil ictimaiyyəti qarşısında qoyduğu vəzifələr Pedaqoji Universitetin və onun Quba filialının kollektivi tərəfindən də yüksək məsuliyyətlə qəbul olunur və prosesə xüsusi elmi-pedaqoji həssaslıqla yanaşılır. Məhz bu baxımdan da "Yaşıl dünya naminə yaşıl təhsil" ADPU-nun Quba filialının gündəlik fəaliyyətində vacib çağırışdır.

Rəsmi açılış mərasimində Azərbaycan Dövlət Pedaqoji Universitetinin rektoru professor Cəfər Cəfərov, Milli Məclisin deputatı professor Əlibala Məhərrəmzadə, Elm və Təhsil Nazirliyinin Coğrafiya İnstitutunun baş direktoru professor Zakir Eminov, Pedaqoji Universitetin rektor müşaviri Ümid Mehdiyev, ADPU-nun Quba filialının direktoru dosent Yusif Alıyev, Bişkek Musiqi Pedaqoji İnstitutunun (Qırğızıstan) professoru Ulanbek Mambetakunov, Stavropol Dövlət Pedaqoji İnstitutunun Yessentuki filialının (Rusiya Federasiyası) dosenti Marina Çotçayeva, Pəncab Universitetinin (Pakistan) professoru Safdar Ali Şirazi və başqaları iştirak ediblər.

Məlumat verilib ki, konfransa ümumilikdə 74 məqalə təqdim olunub. Onlardan 54-ü Təşkilat Komitəsinin redaksiya heyəti tərəfindən təsdiqlənib. Məqalələrdə bütün sahələri əhatə edən qlobal məkanda aktual olan ən vacib beynəlxalq problemlərə toxunulur.

Ümumilikdə konfransın təşkilinə 7 ölkədən 12 ali məktəb dəstək verib.

Qeyd edək ki, konfrans çərçivəsində həm də filialda Vətən müharibəsi şəhidi kapitan Aqil Məlikovun adını daşıyan auditoriyanın açılışı olub.

## Quba filialının müəllimi Volqoqrad tələbələrinə “Türk Dövlətləri Təşkilatı” mövzusunda mühazirə oxuyub



ADPU-nun Quba filialı Rusiya Federasiyasının Volqoqrad Dövlət Universiteti və İctimai Diplomatiya Mərkəzi ilə birgə "Beynəlxalq münasibətlər" ixtisasının tələbələri üçün mühazirə təşkil edib.

Pedaqoji Universitetin Quba filialının Humanitar elmlər kafedrasının baş müəllimi, tarix üzrə fəlsəfə doktoru Təhminə Əliyeva Volqoqrad Dövlət Universitetinin tələbələri üçün "Türk Dövlətləri Təşkilatı" mövzusunda mühazirə oxuyub. Mühazirədə türk dövlətləri arasında əməkdaşlıq və inteqrasiyanın dərinləşməsinə yönəlmiş beynəlxalq əhəmiyyətli layihələrin Avrasiya üçün oynadığı tarixi roldan bəhs edilib, həmçinin, Türk Dövlətləri Təşkilatının təşəkkülü, Avrasiyada qarşılıqlı səmərəli siyasi-iqtisadi əlaqələrin genişlənməsi kimi məsələlərə toxunulub.

## ADPU tələbələri asudə vaxtlarını səmərəli keçirirlər - ekskursiyalar, dərnəklər, yarışlar...






Universitetdə fəaliyyət göstərən tələbə təşkilatları və maraq klubları tələbələrin asudə vaxtının səmərəli təşkili, sosial-ictimai aktivliklərinin artırılması üçün mütəmadi olaraq müxtəlif mövzularda maraqlı layihələr – ekskursiyalar, dərnək məşğələləri, intellektual yarışlar və s. həyata keçirirlər. Bu baxımdan həftəsonları tələbələr üçün xüsusilə faydalı keçir. Belə ki, oktyabrın 12-də ADPU Təhsil Könüllüləri Tələbə Birliyinin (ADPU TKTB) nəzdində fəaliyyət göstərən dərnəklərin fəaliyyətinə yenidən start verilib. Xarici dil dərnəyində ingilis dili üzrə təlimlərə, rəqs dərnəyində milli rəqslərin öyrədilməsinə başlanılıb. Musiqi dərnəyi çərçivəsində isə piano aləti ilə birgə ilk dəfə olaraq gitara alətində ifa dərslərinin keçirilməsinə başlanılıb. Qeyd edək ki, bu dərnəklərdə "tələbənin-tələbədən öyrənməsi" prinsipi ilə istedadlı tələbələr tərəfindən digər tələbə yoldaşları üçün müxtəlif mövzularda praktik məşğələlər təşkil olunur. Həftəsonu digər maraqlı tədbir isə Tələbə Həmkarlar İttifaqı Komitəsi (THİK) tərəfindən keçirilib. ADPU THİK nəzdində Əyləncə və məntiq klubunun təşkilatçılığı ilə oktyabrın 12-də tələbələrin "Yarat" Müasir İncəsənət Mərkəzinə ekskursiyası təşkil edilib. Ekskursiya çərçivəsində tələbələr mərkəzdə olan eksponatlarla tanış olub, onları maraqlandıran suallara cavab tapıblar.

## Yeni qəbul olunmuş tələbələr ADPU-nun Heydər Əliyev Mərkəzində



## Ailə planlaşdırılması ilə bağlı tədbir



Oktyabrın 14-də ADPU-da universitetin tələbə poliklinikası (4 nömrəli Tələbə Poliklinikası) və 1 nömrəli Qadın Məsləhətxanasının birgə təşkilatçılığı ilə tələbələr üçün "Reproduktiv sağlamlıq və ailə planlaşdırılmasının tibbi-sosial-iqtisadi cəhətdən əhəmiyyəti" mövzusunda maarifləndirmə tədbiri keçirilib.

Tədbirdə çıxış edən ADPU-nun tələbə poliklinikasının baş həkimi Şəfəq Teymurova qeyd edib ki, gənclərin reproduktiv sağlamlıq və ailə planlanması mövzularında yetərli məlumata sahib olmaları olduqca əhəmiyyətlidir. Əhalinin sağlamlığının qorunması, xüsusilə reproduktiv sağlamlıq və ailə planlaşdırılması məsələləri müvafiq Dövlət Proqramlarında öz əksini tapır və buna uyğun olaraq bütün ölkə ərazisində maarifləndirici tədbirlər təşkil olunur.

Daha sonra 1 nömrəli Qadın Məsləhətxansının ixtisaslı həkimləri tərəfindən tələbələrə ailə planlaşdırılmasının əhəmiyyəti və reproduktiv sağlamlıqla bağlı ətraflı məlumat verilib, onları maraqlandıran suallar cavablandırılıb.

Tədbirdə universitetin 100-dək tələbəsi iştirak edib.

## Prorektor Avstraliyanın Təhsil Tədqiqatları Şurasının (ACER) təlimlərində



ADPU-nun strateji inkişaf məsələləri üzrə prorektoru Könül Pirverdiyeva Azərbaycan Respublikası Təhsil İnstitutunun təşkilatçılığı (ARTİ) ilə Avstraliyanın Təhsil Tədqiqatları Şurası (ACER) tərəfindən keçirilən "Təhsilalanların səriştəsaslı qiymətləndirilməsi - Test Hazırlama" təlimlərində iştirak edib. 5 gün ərzində davam edən təlimlərdə əsas məqsəd qiymətləndirmə çərçivə sənədinin hazırlanması, tapşırıqlar üçün təlimatların və stimulların seçilməsi, çoxseçimli tapşırıqların və yaradıcı cavab tələb edən tapşırıqların hazırlanması, testlərin tərtibi üzrə təlimatlar və keyfiyyət təminatı daxil olmaqla, test dizaynı və tapşırıq yazılması istiqamətində müəllimləri inkişaf etdirmək olub.

Oktyabrın 14-də ADPU-nun Heydər Əliyev Mərkəzində "Heydər Əliyev dərsləri"nin növbəti məşğələsi keçirilib. Dərsdə iştirak edən Tarix və coğrafiya fakültəsinin I tədris ili tələbələri ilk olaraq mərkəzin müdiri Tahir Süleymanovun "Azərbaycan tarixinin Heydər Əliyev mərhələsi" mövzusundakı mühazirəsini dinləyib, görkəmli dövlət xadimlərinin Ulu Öndər haqqında söylədiyi fikirlərdən ibarət təqdimatı izləyiblər.

Mərkəzin mütəxəssisi Tərlan Ağayev dərs iştirakçılarını mərkəzin eksponatları ilə tanış edib. O, bildirib ki, mərkəzdə H.Əliyevin həyat və fəaliyyətinin müxtəlif dövrlərini əks etdirən 181 adda kitab, 169 fotoşəkil, 13 arxiv sənədinin surəti, 12 suvenir və digər əşyalar saxlanılır.

Dərsin "film saatı" bölümündə gənclər Heydər Əliyevə həsr olunmuş qısametrajlı sənədli filmi izləyiblər.

Sonda Ulu Öndərin həyat və fəaliyyəti ilə bağlı tələbələri maraqlandıran suallar cavablandırılıb, geniş müzakirə aparılıb.

Qeyd edək ki, Ulu Öndərin yüzillik yubileyi münasibətilə başlanan analoji fəaliyyət artıq üçüncü tədris ilidir ki, universitetin müxtəlif fakültələrində davam etdirilir. "Heydər Əliyev dərsləri"nin tədris ili ərzində digər fakültələrin tələbələri üçün də təşkil edilməsi nəzərdə tutulub.

## Pedaqoji Universitetə qəbul olunan doktorant və dissertantlara vəsiqələr təqdim olunub





Oktyabrın 18-də ADPU-da 2024-cü il üzrə fəlsəfə doktoru proqramı üzrə doktorantura və dissertanturaya qəbul olunanlarla görüş keçirilib. Tədbirdə ADPU-nun rektoru professor Cəfər Cəfərov, elm və innovasiyalar üzrə prorektor professor Asəf Zamanov, Magistratura və doktorantura şöbəsinin müdiri s.e.f.d. Rəşad Sadıqov, eləcə də yeni qəbul olunan doktorant və dissertantlar iştirak edib.

Açılış sözü ilə çıxış edən Pedaqoji Universitetin rektoru prof. Cəfər Cəfərov tədbir iştirakçılarını salamlayaraq, Müstəqilliyin Bərpası Günü münasibətilə təbriklərini çatdırıb. Yüksəkixtisaslı mütəxəssislərin cəmiyyətin inkişafında oynadığı mühüm roldan danışan rektor doktorant və dissertantların öz elmi araşdırmaları ilə həm ölkənin, həm də dünyanın gələcəyinə töhfə verəcəyini vurğulayıb. Prof. C.Cəfərov, həmçinin doktorantlara dil bilikləri və texnoloji bacarıqlarını daim inkişaf etdirməyi, bu bacarıqların təhsil və tədqiqat işlərində yeni perspektivlər açaraq elmin inkişafına təkan verən önəmli vasitələr olduğunu qeyd edib. Rektor gənc tədqiqatçılara uğurlar arzulayaraq, tədqiqat işlərində ən müasir və aktual, innovativ elmi-pedaqoji istiqamətlərə üstünlük verməlarini tövsiyə edib.

Çıxış edən ADPU-nun elm və innovasiyalar üzrə prorektoru prof. Asəf Zamanov diqqətə çatdırıb ki, cari ildə Pedaqoji Universitetdə fəlsəfə doktorluğu proqramı üzrə təhsil almaq üçün ümumilikdə 45 nəfər yerli və əcnəbi namizəd müraciət edib. Qəbulun nəticələrinə əsasən, 9 nəfər doktoranturaya, 1 nəfər isə dissertanturaya qəbul olunub. Vurğulanıb ki, qəbul olunan doktorantlardan biri Hökumətlərarası Təqaüd Proqramı çərçivəsində ADPU-nun doktoranturasına qəbul olunan Çin Xalq Respublikasının vətəndaşıdır. Doktorant və dissertantlara müvafiq vəsiqələr təqdim edilib.

# Pedaqoji Universitetdə yubiley tədbiri: İrəvan Azərbaycanlı Pedaqoji Məktəbi -100



Oktyabrın 17-də ADPU-da beynəlxalq əlaqələr üzrə prorektor, professor Mahirə Hüseynovanın təşəbbüsü ilə təhsil tariximizdə özünəməxsus yeri və rolu olan İrəvan Azərbaycanlı Pedaqoji Məktəbinin 100 illik yubileyinə həsr olunmuş konfrans keçirilib. Yubiley tədbirində Milli Məclisin deputatları, Respublikanın bir sıra ali məktəblərinin rektorları, elm xadimləri, tanınmış təhsil işçiləri və Qərbi Azərbaycan İcmasının nümayəndələri iştirak ediblər.

Qonaqlar, əvvəlcə, Pedaqoji Universitetin foyesində Qərbi Azərbaycanda Azərbaycan ictimai-siyasi mühitini və İrəvan Azərbaycanlı Pedaqoji Məktəbinin fəaliyyət dövrünü əks etdirən sərgi ilə tanış olub, universitetin Filologiya fakültəsinin tələbələrinin ifasında müxtəlif milli rəqslərə tamaşa edib, şeirlər dinləyiblər.

Tədbiri giriş sözü ilə açan ADPU-nun prorektoru, Qərbi Azərbaycan İcmasının Dərələyəz mahalı Keşkənd rayonu üzrə icma rəhbəri professor Mahirə Hüseynova 100 yaşlı İrəvan Azərbaycanlı Pedaqoji Məktəbinin mövcud olduğu dövrdəki fəaliyyəti, keçdiyi şərəfli inkişaf yolu haqqında danışmış, məktəbin görkəmli məzunlarının adlarını xatırlatmışdır. Bildirmişdir ki, erməni şovinizmi əhatəsində milli məktəblərimizin pedaqoji kadrlarla təmin edilməsində İrəvan Azərbaycanlı Pedaqoji Məktəbinin və adları təhsil tariximizə qızıl hərflərlə yazılmış fədakar müəllim kollektivinin misilsiz xidmətləri olub. Tədbirdə çıxış edən ADPU-nun rektoru professor Cəfər Cəfərov və Qərbi Azərbaycan İcmasının İdarə Heyətinin sədri, Milli Məclisin deputatı Əziz Ələkbərli milli-tarixi irsimizin tədqiqi və təbliği, xüsusən Qərbi Azərbaycan həqiqətlərinin təbliği baxımından bu kimi tədbirlərin əhəmiyyətini vurğulayıb, bu istiqamətdə Pedaqoji Universitetin bir çox layihələr icra etdiyini, ali təhsil ocağında Qərbi Azərbaycan Araşdırmalar Mərkəzinin uğurla fəaliyyət göstərdiyini diqqətə çatdırıblar.

Daha sonra filologiya üzrə fəlsəfə doktoru, dosent Cəlal Allahverdiyev, Qərbi Azərbaycan İcmasının Nəzarət-Təftiş Komissiyasının sədri professor Vahid Novruzov, millət vəkilləri Hikmət Babaoğlu, Ramin Həsən, Məlahət İbrahimqızı, Qərbi Azərbaycan İcmasının Ziyalılar Şurasının üzvü professor Əvəz Ələkbərov çıxış edərək İrəvan Azərbaycanlı Pedaqoji Məktəbinin Qərbi Azərbaycanda milli maarifçilik mühitin inkişafında və formalaşmasındakı müstəsna xidmətləri, görkəmli məzunlarının elm, təhsil, mədəniyyət, dövlət quruculuğu sahələrindəki fəaliyyətləri barədə geniş məlumat veriblər.



Tədbirdə, həmçinin ADPU-nun Filologiya fakültəsinin dekanı, filologiya üzrə fəlsəfə doktoru Könül Həsənova və filologiya üzrə fəlsəfə doktoru, dosent Cəlal Allahverdiyevin müəllifi olduqları "Tarixi təhsil ocağı: İrəvan Azərbaycanlı Pedaqoji Məktəbi" kitabı təqdim olunub. Kitabda 1924-1948-ci illərdə fəaliyyət göstərən və Qərbi Azərbaycandakı milli məktəblərimizin pedaqoji kadrlarla təmin olunmasında müstəsna rolu olmuş məktəbin yaranması, inkişafı və məzunlarından bəhs olunur. Sonda İrəvan Azərbaycanlı Pedaqoji Məktəbinin fəaliyyətini əks etdirən film nümayiş etdirilib.

# Pedaqoji Universitetdə ölkəmizdə ilk dəfə "Təhsildə Estoniya təcrübəsi" Beynəlxalq konfransı keçirilib

Oktyabrın 19-da Pedaqoji Universitetdə "Təhsildə Estoniya təcrübəsi" mövzusunda beynəlxalq konfrans keçirilib.

Azərbaycan Dövlət Pedaqoji Universiteti, Azərbaycan Təhsil İşçiləri Azad Həmkarlar İttifaqı Respublika Komitəsi, XXI Əsr Beynəlxalq Təhsil və İnnovasiya Mərkəzinin tərəfdaşlığı, "T-Network" təhsil işçilərinin təcrübə və kommunikasiya platformasının təşkilatçılığı ilə keçirilən beynəlxalq konfransın açılış mərasimində Milli Məclisin deputatı Mehriban Vəliyeva, Azərbaycan Dövlət Pedaqoji Universitetinin rektoru professor Cəfər Cəfərov, Azərbaycan Təhsil İşçiləri Azad Həmkarlar İttifaqı Respublika Komitəsinin sədr müavini Mirzə Cəfərzadə və "T-Network" təhsil işçilərinin təcrübə və kommunikasiya platformasının rəhbəri Cəfər Mənsimi çıxış ediblər. Çıxışlarda Azərbaycan təhsil sistemində əldə olunan nailiyyətlər diqqətə çatdırılaraq, müasir qabaqcıl təhsil sistemlərinin uğurlu təcrübələrinin də öyrənilməsinin vacibliyi vurğulanıb. Qeyd olunub ki, konfransın keçirilməsində əsas məqsəd Estoniyanın təhsil sistemi ilə tanış olmaq və bu sahədə təcrübə mübadiləsi aparmaqdır. Pedaqoji Universitetin rektoru prof. Cəfər Cəfərov vurğulayıb ki, təhsil sahəsində qabaqcıl təcrübələrin, müasir texnologiyaların və yeniliklərin tətbiqi istiqamətində təcrübə mübadiləsi hər zaman inkişafın təməl daşıdır. Bu baxımdan, Estoniyanın təhsildə qazandığı uğurlar dəyərli bir nümunədir.

Rektor bildirib ki, Estoniya rəqəmsal təhsil sisteminin qurulması və təhsil proseslərinin modernləşdirilməsi sahəsində dünya miqyasında ön sıralarda yer alır. Rəqəmsal texnologiyalarla zənginləşdirilmiş tədris proqramları, müəllim hazırlığının müasir standartlar üzrə təşkil olunması və təhsil sisteminin



inklüzivliyinin artırılması istiqamətində Estoniya təcrübəsi təkcə Avropa ölkələri üçün deyil, həmçinin bizim üçün də dəyərli təcrübələr təqdim edir. Bu baxımdan təhsilimizin dünya standartlarına uyğunlaşdırılması, tədris prosesinin səmərəliliyinin artırılması üçün beynəlxalq təcrübələrdən yararlanmağa böyük əhəmiyyət verən ADPU daimi olaraq bu kimi tədbirlərə ev sahibliyi edir.

Konfransda Estoniya Təhsil və Tədqiqatlar Nazirliyinin yeni tədris proqramlarının hazırlanması üzrə işçi qrupunun üzvü, Tallin Universitetində təhsilin idarəolunması üzrə müəllim, Eston Dili İnstitutunun tədqiqatlar üzrə layihə rəhbəri, psixoloq Stanislav Nemerjitski, Estoniyada dövlət bağçalarının mentoru, Tallin Məktəbəqədər Təhsil üzrə Direktorlar Assosiasiyasının İdarə Heyətinin üzvü Riina Lail, Estoniyada "Lingatore" xarici dil tədrisi mərkəzinin rəhbəri, xarici dil tədrisi üzrə metodist, baş müəllim Evelin Müüripeal, Estoniyanın təhsildə inteqrasiya üzrə Dövlət Proqramının mentoru, "Təhsildə ilin adamı" mükafatı laureatı Sənəm Əliyeva təqdimatla çıxış edərək öz təcrübələrini bölüşüblər.

Təqdimatlarda "Estoniyanın PISA uğuru: əsas səbəblər", "İdarəetməni dəyişin: uşaqyönümlü öyrənmə mühitini necə yaratmaq olar?", "Estoniya təhsilinə baxış", "Effektiv öyrənmə mühiti" kimi mövzulara toxunulub, müzakirələr aparılıb.

# ADPU-nun müəllimi beynəlxalq festivalın "Qran-Pri"sini qazanıb




ADPU-nun İncəsənət və fiziki tərbiyə fakültəsinin Musiqi və onun tədrisi texnologiyası kafedrasının müəllimi Aygün Abaszadə "Astana Stars" - İtaliya-Qazaxıstan 2024 V Beynəlxalq Musiqi Festivalında "Milli vokal" kateqoriyası üzrə Qran Pri mükafatına layiq görülüb.

Həmçinin, müsabiqədə kafedranın baş müəllimi Gülarə Aslanova da xüsusi diplomla təltif olunub.

# İqtisadçı ekspert Eldəniz Əmirovun ustad dərsi



Oktyabrın 22-də ADPU-da magistrantlar üçün Kiçik və Orta Biznesin İnkişafı Agentliyinin (KOBİA) departament rəhbərinin müavini, iqtisadçı ekspert Eldəniz Əmirovun ustad dərsi təşkil edilib.

Giriş sözü ilə çıxış edən ADPU-nun elm və innovasiyalar üzrə prorektoru professor Asəf Zamanov qeyd edib ki, magistrantların öyrəndikləri nəzəri biliklərin praktik təcrübələrlə əlaqələndirilməsi üçün universitetdə mütəmadi olaraq tanınmış elm adamları, dövlət və özəl sektorun təcrübəli mütəxəssisləri ilə silsilə görüşlər, dəyirmi masa və ustad dərsləri təşkil edilir. Prorektor bugünkü görüşdə də ekspert Eldəniz Əmirovun geniş praktik təcrübəsinin və idarəçilik bacarıqlarının magistrantlar üçün səmərəli öyrənmə mühiti yaradacağını və dərsdə iştirak edənlərin bu fikir mübadiləsindən zəngin təcrübə əldə edəcəklərini qeyd edib. Pedaqoji Universitetdə ixtisaslı magistr hazırlığı sahəsində aparılan islahatlardan bəhs edən A.Zamanov diqqətə çatdırıb ki, son illərdə, xüsusilə, təhsil idarəetməsi üzrə yeni ixtisaslaşmalar yaradılıb, mövcud ixtisaslaşmalarda isə tədris istiqamətləri genişləndirilib. Prorektor bütün istiqamətlər üzrə təhsilalanların peşəkar inkişafı üçün universitet tərəfindən lazımi dəstəyin təmin edildiyini nəzərə çatdırıb, magistrantları bu fürsətləri maksimum səviyyədə dəyərləndirməyə və peşəkar səriştələrə yiyələnmək yolunda fəallıq göstərməyə çağırıb. Çıxış edən iqtisadçı ekspert Eldəniz Əmirov təşkil edilən görüş üçün universitet rəhbərliyinə təşəkkürünü bildirib, bu cür görüş və müzakirələrin təhsilalanların inkişaflarında əhəmiyyətini xüsusi vurğulayıb. İqtisadiyyat sahəsindəki müasir tendensiyalardan, təhsil və iqtisadiyyatın qarşılıqlı əlaqəsindən danışan ekspert tələbələrə öz peşəkar inkişaflarında hansı bacarıqları inkişaf etdirməli olduqları barədə tövsiyələr verib. Qonaq, xüsusilə, rəqəmsal texnologiyaların iqtisadiyyata təsirindən və bu sahədəki yeniliklərin gələcək peşəkar mühitə necə təsir edəcəyindən bəhs edib.

Ustad dərsi E.Əmirovun iqtisadi prosesləri daha yaxşı başa düşmək və gələcəkdə bu sahədə uğur qazanmaq üçün lazım olan praktik biliklər və strategiyalar haqqında geniş təqdimatı ilə davam edib. O, yeni nəşr etdirdiyi "Avrasiyanın arteriyaları" kitabı haqqında danışaraq, əsərdə toxunulan aktual məsələləri vurğulayıb.

İnteraktiv formada keçən ustad dərsi iştirakçıları maraqlandıran sualların cavablandırılması ilə yekunlaşıb.

## Tələbələrimiz Beynəlxalq Astronavtika Konqresində



İtaliyanın Milan şəhərində 75-ci Beynəlxalq Astronavtika Konqresi keçirilib. Konqresdə ölkəmizi təmsil edən 52 tələbə, gənc mütəxəssis və alimlərdən ibarət milli elmi komandanın tərkibində Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) SABAH qruplarının Riyaziyyat və informatika müəllimliyi ixtisasının V tədris ili tələbələri Aygül Əliyeva və Tünzalə Məmmədova da yer alıblar.

Aygül Əliyeva konqresdə "Exploring Martian Sedimentary Rocks Insights into the Red Planet's Geological History" ("Mars çöküntü süxurlarının tədqiqi. Qırmızı planetin geoloji tarixinə dair fikirlər") adlı məqalə ilə çıxış edib. Bu məqalədə Marsdakı çöküntü daşlarının planetin geoloji tarixini necə açdığı və keçmişdə orada mümkün olan yaşam izlərinə dair nümunələrdən bəhs olunur. Araşdırma Marsın geoloji təkamülü və ətraf mühit şəraiti haqqında əhəmiyyətli məlumatlar təqdim edir.

Tünzalə Məmmədovanın təqdim etdiyi "Prognosing how time passes in a black hole: A study in physics and cosmology" ("Qara dəlikdə zamanın necə keçdiyinin proqnozlaşdırılması. Fizika və kosmologiyada tədqiqat") adlı məqalədə isə zaman və qara dəlik anlayışları haqqında elmi və fəlsəfi məlumatlar əks olunub. Məqalədə, həmçinin qara dəliklərdə zamanın necə axması, bu prosesi proqnoz etməyin necə mümkün olması haqqında tələbənin apardığı araşdırmalardan bəhs olunub. Qeyd edək ki, T.Məmmədova ötən il də öz məqaləsi ilə İAC2023-də çıxış edib.

## ADPU İstanbul Universiteti ilə əməkdaşlığa başlayır



Oktyabrın 23-də Türkiyə Respublikasının İstanbul Universitetində Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) rektoru professor Cəfər Cəfərov və İstanbul Universitetinin rektoru professor Osman Bülənd Zülfiqar arasında görüş keçirilib.

Görüş çərçivəsində tərəflər rəhbərlik etdikləri ali təhsil müəssisələrinin fəaliyyət istiqamətləri haqqında məlumat təqdim edib, əməkdaşlıq imkanlarını müzakirə ediblər. Görüşün yekununda prof. C. Cəfərov və prof. O. B. Zülfiqar universitetlər arasında qarşılıqlı əməkdaşlığa dair memorandum imzalayıblar.

## "Bioloji müxtəlifliyin mühafizəsi: Botanika, ekologiya və yaşıl şəhərlər" – forum



23-25 oktyabr tarixlərində Azərbaycan Respublikası Elm və Təhsil Nazirliyinin Botanika İnstitutunda COP29 və "Yaşıl dünya naminə həmrəylik ili"nə həsr olunmuş "Bioloji müxtəlifliyin mühafizəsi: Botanika, ekologiya və yaşıl şəhərlər" mövzusunda forum keçirib. Forum Azərbaycan Respublikası Elm və Təhsil Nazirliyi, Botanika İnstitutu, Azərbaycan Dövlət Pedaqoji Universiteti (ADPU), Mərkəzi Nəbatat Bağı Publik Hüquqi Şəxs, Dendrologiya Bağı Publik Hüquqi Şəxs və Azərbaycan Botaniklər Cəmiyyəti İctimai Birliyinin birgə təşkilatçılığı ilə baş tutub. Forumun açılış mərasimində bir sıra dövlət nümayəndələri, yerli və xarici alim və mütəxəssislər iştirak ediblər. Tədbirdə çıxış edən Botanika İnstitutunun baş direktoru professor Səyyarə İbadullayeva ölkə başçısı cənab İlham Əliyevin "Bakıdakı COP üçün seçdiyimiz "Yaşıl dünya naminə həmrəy olaq" şüarının Azərbaycanın COP29 missiyamızın ruhunu əks etdirdiyini ifadə edib. O, COP29 çərçivəsində "Müharibə gedən ölkələrdə ekosistemlərə dəyən ziyanın qiymətləndirilməsi və bərpası ittifaqı"nın yaradılması təklifinin irəli sürülməsinin məqsədəuyğun olduğunu qeyd edib. Daha sonra Elm və Ali Təhsil üzrə Dövlət Agentliyinin nümayəndəsi Aysel Qaribli, AMEA-nın vitse-prezidenti akademik İradə Hüseynova, BDU-nun Biologiya fakültəsinin dekanı professor Afət Məmmədova, ADPU-nun beynəlxalq əlaqələr üzrə prorektoru professor Mahirə Hüseynova, Kimya və biologiya fakülәsinin dekanı dosent Reyhan Ağayeva və dekan müavini dosent Bəsti Əsədova, Mərkəzi Nəbatat Bağı Publik Hüquqi Şəxsin İdarə Heyətinin sədr müavini Natiq Allahverdiyev, Dendrologiya Bağı Publik Hüquqi Şəxsin İdarə Heyətinin sədr müavini dosent Samirə Bağırova, Torpaqşünaslıq və Aqrokimya İnstitutunun baş direktoru, AMEA-nın müxbir üzvü Əlövsət Quliyev, Çelyabinsk Dövlət Universitetinin Geoekologiya və ətraf mühitin idarə edilməsi kafedrasının müdiri dosent Dmitriy Dvinin çıxış edərək forumun işinə uğurlar arzulayıblar. Forumda, həmçinin Kimya və biologiya fakültəsinin müəllimləri dos. Xoşqədəm İbrahimova, dos. Təranə Abdullayeva, dos. Amaliya Həsənova, k.ü.f.d. Afət Hacıyeva və tələbələr çıxış ediblər.

## Professor Səlahəddin Gelbalın modul dərsi



21-25 oktyabr tarixlərində ADPU SABAH qruplarının təşkilatçılığı ilə Türkiyənin Hacəttəpə Universitetinin professoru Səlahəddin Gelbal tərəfindən universitetin magistrantları üçün "Təhsildə qiymətləndirmə və monitorinqin əsasları" mövzusunda modul dərs keçirilib. Modul dərsdə ADPU-nun Təhsildə qiymətləndirmə və monitorinq (SABAH), Təhsildə qiymətləndirmə və monitorinq, Təlim və tədrisin təşkili və metodikası və Biznesin təşkili və idarə olunması (təhsilin təşkili və idarə olunması) (MBA) ixtisaşmaları üzrə təhsil alan ümumilikdə 70-dən çox magistrant iştirak edib. 5 günlük modul dərsdə magistrantlar qonaq professorun təqdimatında təhsil sahəsində qiymətləndirmə və monitorinqə dair qabaqcıl təcrübələrlə bağlı bilgilər əldə edərək, qarşılıqlı müzakirələr aparıblar.

## "Pedaqoji Universitetin Gələcək Təhsil Liderləri"nin mentorluq proqramı uğurla davam edir



Azərbaycan Dövlət Pedaqoji Universitetində keçirilən "Pedaqoji Universitetin Gələcək Təhsil Liderləri" müsabiqəsinin qalib və xüsusi mükafatçıları üçün mentorluq proqramı uğurla davam edir. Müsabiqə çərçivəsində qalib və xüsusi mükafatçı olmuş tələbələr universitet rəhbərliyi və struktur rəhbərlərindən təyin edilmiş mentorlarla görüşərək şəxsi və karyera inkişafları üçün vacib mentor dəstəyi alır, mentorlarının peşəkar təcrübələrindən faydalanırlar. Həmçinin, tələbələr mütəmadi olaraq müxtəlif strukturların real iş fəaliyyətində iştirak edərək peşəkar və karyera inkişafları üçün əhəmiyyətli praktik səriştələr qazanmaq şansı əldə edirlər.

Layihənin keçirilməsində məqsəd bacarıqlı və yüksək potensiallı gənclərin müəyyən edilərək onların inkişafına dəstəyin göstərilməsi və universitetin gələcək kadr bankının formalaşdırılmasıdır. Mentorluq proqramının 1 il davam etməsi nəzərdə tutulub. Proqramı uğurla başa vuran tələbələr müvafiq referans məktubu əldə edəcəklər.

Qeyd edək ki, cari ildə keçirilmiş "Pedaqoji Universitetin Gələcək Təhsil Liderləri" müsabiqəsində universitet və onun filiallarında təhsil alan, ümumilikdə 1000-ə yaxın tələbə və magistrant iştirak edib. 4 mərhələdən ibarət olan müsabiqənin yekununda qalib və xüsusi mükafatçı olan 20 tələbə 1000 AZN pul mükafatı, 1 illik xarici dil və İT kursları ilə yanaşı, eyni zamanda 1 illik mentorluq proqramında iştirak etmək şansı da qazanıblar.

Müsabiqənin növbəti illərdə də təşkil edilməsi nəzərdə tutulub. "bp Azərbaycan" şirkəti, "Prestij-S" Tədris Mərkəzi və "IT Brains Academy" müsabiqənin sponsorlarıdır.

## Tələbə təşkilatlarının infosessiyaları keçirilib



ADPU-nun bakalavriat səviyyəsinə cari tədris ilində qəbul olunmuş tələbələr üçün universitet daxilində fəaliyyət göstərən tələbə təşkilatları və maraq klublarının təqdimatı məqsədilə infosessiyalar təşkil olunub.

İnfosessiya görüşləri universitetin fakültələrində növbəli şəkildə təşkil edilib. Görüşlərdə Pedaqoji Universitetin Tələbə Gənclər Təşkilatı (TGT), Tələbə Həmkarlar İttifaqı Komitəsi (THİK), Təhsil Könüllüləri Tələbə Birliyi (TKTB), Yeni Klub, MEH ədəbi dərnəyi, YUNESKO Klubu və Kiber Klub kimi müxtəlif istiqamətlər üzrə fəaliyyət göstərən tələbə təşkilatlarının rəhbərləri çıxış edərək rəhbərlik etdikləri təşkilatların fəaliyyət istiqamətləri, tələbələrin ictimai-sosial aktivliklərinin artırılması məqsədilə həyata keçirdikləri tədbirlər barədə tələbələri məlumatlandırıb, təşkilatlara üzvlük qaydaları barədə onları maraqlandıran sualları cavablandırıblar.

Qeyd edək ki, tələbələrin asudə vaxtlarının səmərəli təşkili, onların hərtərəfli inkişafının təmini məqsədilə Pedaqoji Universitetdə 7 tələbə təşkilatı və 40-dan çox maraq klubu fəaliyyət göstərir.

## ADPU-nun alimləri II Beynəlxalq Elmi-Ekspert Forumunda iştirak ediblər

25-26 oktyabr tarixlərində Belarus Respublikasının Moqilev şəhərində A.A.Qromıko adına II Beynəlxalq Elmi-Ekspert Forumu keçirilib. Forum Rusiya Dövlət Humanitar Universiteti (RDHU), Rusiya Elmlər Akademiyası, A.A.Qromıko adına Xarici Siyasət Tədqiqatları Cəmiyyəti və Belarus-Rusiya Universitetinin təşkilatçılığı ilə baş tutub. 5 bölmədən ibarət formda 8 ölkədən olan aparıcı mütəxəssis, tədqiqatçı və alimlər iştirak ediblər.

Ölkəmizi forumda ADPU-nun Azərbaycan tarixi kafedrasının müdiri dosent Naibə Əhmədova və kafedranın müəllimi Sahibə Musayeva təmsil ediblər.

Forumda dos. Naibə Əhmədova "Belarusiya və Rusiyanın, həmçinim digər MDB ölkələrinin elmi əlaqələri: bugün və sabah" bölməsində "Azərbaycan-Belarusiya əlaqələri: tarix və müasir vəziyyət" mövzusunda, Sahibə Musayeva isə "Belarusiya və Rusiya xalqlarının birgə tarixi və ümumi tarixi yaddaş: Belarusiya və ümumilikdə SSRİ-nin faşist işğalçılarından azad olmasının 80 illiyinə dair" bölmədə "II Dünya müharibəsində Belarusiyanın faşist işğalçılarından azad edilməsində iştirak edən azərbaycanlılar: Belarusiyanın faşist işğalından azad olunmasının 80 illiyi" mövzusunda məruzə ilə çıxış ediblər. Məruzələrdə Belarusiya və Azərbaycan respublikaları arasında tarixi əlaqələr, xüsusilə, hər iki respublika müstəqillik əldə




etdikdən sonra bu əlaqələrin strateji müttəfiqlik səviyyəsinə yüksəlməsi, geniş sahəni əhatə edən əməkdaşlıq əlaqələri, o cümlədən, Belarusiyanın Minsk, Qrodno, Moqilev və Molodecno şəhərlərinin, Brest qalasının müdafiəsində iştirak edən azərbaycanlıların (Məlik Məhərrəmov, Adil Quliyev, Həzi Aslanov, Aslan Vəzirov və s.) göstərdikləri şücaətlərindən bəhs edilib.

Qeyd edək ki, 2 gün davam edən beynəlxalq forumun keçirilməsində məqsəd Avrasiya məkanında dövlətlərarası humanitar əməkdaşlığın inkişafı istiqamətindəki addımlara dəstək olub.

## Tələbələr üçün Zəfər, yaradıcılıq və inkişaf silsiləsi



ADPU-da tələbələrin intellektual, mədəni və yaradıcılıq bacarıqlarının inkişaf etdirilməsi, eləcə də universitetdə aktiv tələbə mühitinə töhfə vermək məqsədilə silsilə tədbir və layihələr icra olunur. Bu baxımdan Pedaqoji Universitetdə həftəsonları xüsusilə rəngarəng keçir. Bu şənbə də bu baxımdan istisna deyil. Oktyabrın 26-da Tələbə Həmkarlar İttifaqı Komitəsi (ADPU THİK) tərəfindən Vətən müharibəsi qəhrəmanlarını anmaq məqsədi ilə təşkil olunab "Zəfər turniri" intellektual yarışı ilə "tələbə günü"nə start verilib.

Yarışın açılışında sosial və humanitar məsələlər üzrə prorektor professor Fikrət Rzayev, Tədbirlərin təşkili və tələbələrlə iş şöbəsinin müdiri Turan Kərimli və şöbənin əməkdaşı İsmayıl Nəsirov tələbələrə öz dəstəklərini ifadə edərək belə tədbirlərin gənclər arasında vətənpərvərlik ruhunun təbliği baxımından əhəmiyyətini vurğulayıblar. 6 turdan ibarət yarış gərgin mübarizə şəraitində keçib.

Eyni zamanda, THİK tərəfindən tələbələrin yaradıcılıq potensialını dəstəkləmək məqsədilə təşkil edilən gitara, piano və skripka dərslərinə də start verilib. Paralel olaraq təşkilat tərəfindən rus dili dərsləri başlanılıb, yaxın günlərdən etibarən ingilis və fransız dilləri üzrə dərslərin də təşkil ediləcəyi gözlənilir.

ADPU Yeni Klubun Tarix və coğrafiya fakültəsi təşkilatının təşəbbüsü ilə oktyabrın 26-da danışma və eşitmə məhdudiyyətli şəxslər üçün işarə dili dərsləri keçirilib. Seminar-dərsdə tələbələr işarə dilində hərfləri öyrəniblər. Yeni Klub tərəfindən, eyni zamanda Kimya və biologiya fakültəsinin tələbələri üçün Bülbülün Memorial Muzeyinə ekskursiya təşkil edilib.

Eyni gündə universitetin Tələbə Gənclər Təşkilatı (ADPU TGT) da bu silsilə tədbirlərə töhfəsini verib. Təşkilatın fəal üzvləri "Keramika Evi"ni ziyarət edərək bu sənətin incəlikləri ilə tanış olub və burada nümayiş edilən maraqlı sənət əsərləri ilə tanış olublar.

Həftəsonunun ən maraqlı layihələrindən biri də universitetin Təhsil Könüllüləri Tələbə Birliyi (ADPU TKTB) tərəfindən təşkil edilib. Təşkilat tələbələrin sosial mediadan düzgün istifadə bacarıqlarına yiyələnməsi məqsədilə ilk dəfə olaraq bir aylıq ödənişsiz SMM dərslərinə start verib. Bununla yanaşı, TKTB tərəfindən Dil dərnəyi çərçivəsində keçirilən alman və rus dili dərslərinin ilk məşğələləri tələbələr tərəfindən böyük maraqla qarşılanıb. Həmçinin Birlik tərəfindən ötən həftələrdən başlanılmış piano, gitara və rəqs dərslərinin növbəti məşğələləri də baş tutub.

Günə TKTB-nin sentyabrdan bu günədək olan fəaliyyətinin dəyərləndirildiyi hesabat iclası ilə yekun vurulub.

## ADPU Kiber Klubun infosessiyası

Oktyabrın 29-da ADPU THİK və ADPU Kiber Klubun birgə təşkilatçılığı ilə "Kibertəhlükəsizlik nədir" mövzusunda "İnfo Sec ADPU" məlumatlandırma sessiyası keçirilib.

Sessiyanı giriş sözü ilə açan ADPU-nun sosial və humanitar məsələlər üzrə prorektoru professor Fikrət Rzayev müasir dövrdə geniş yayılmış kiber təhlükələrə qarşı bu cür maarifləndirmə tədbirlərinin vacibliyi barədə danışaraq, Pedaqoji Universitetin gənclər üçün səmərəli və maarifləndirici olan bu kimi müsbət təşəbbüsləri daim dəstəklədiyini vurğulayıb. Azərbaycan Kibertəhlükəsizlik Platformasının rəhbəri Şahin Əliyev və Azərbaycan Kibertəhlükəsizlik Təşkilatları Assosiasiyasının İdarə Heyətinin sədr müavini Rauf Cabarov çıxış edərək, ölkədə dövlət və qeyri-hökumət təşkilatları tərəfindən kibermaarifləndirmə sahəsində həyata keçirilən tədbirlərdən bəhs ediblər.

Çıxış edən Kiber Təhlükəsizlik Platformasının müəllimi Sadiq Qasımov kibertəhlükəsizlik sahəsində mövcud təhdidlər və bu təhdidlərin texniki tərəfləri barədə tələbələrə məlumat verib.



Platformanın əməkdaşı Rza Şirinov və Paşa Bankın informasiya riskləri üzrə mütəxəssisi Elviyyə Babazadə isə mövcud kibertəhlükələrdən qorunma yolları barədə danışıblar. Sonda ADPU Kiber Klubun rəhbəri Cəmilə Qurbanova yeni yaradılmış klub tərəfindən kibertəhlükəsizlik sahəsində gənclərin maarifləndirilməsinə yönəlmiş tədbirlərin davamlı olaraq təşkil ediləcəyini vurğulayıb.

## STEAM təhsili - problemlər və perspektivlər – konfrans



Oktyabrın 30-da ADPU-nun Fizika fakültəsinin və fakültədə fəaliyyət göstərən STEAM Mərkəzinin təşkilatçılığı ilə "STEAM təhsili - problemlər və perspektivlər" mövzusunda elmi-praktik konfrans keçirilib.

Konfransda ADPU-nun rektoru professor Cəfər Cəfərov, elm və innovasiyalar üzrə prorektor professor Asəf Zamanov, Elmi-təşkilati şöbənin müdiri professor İbrahim Bayramov, Fizika fakültəsinin dekanı, STEAM Mərkəzinin müdiri dosent Arzu Daşdəmirov, universitetin professor-müəllim heyəti və tələbələr iştirak ediblər.

Giriş sözü ilə çıxış edən ADPU-nun rektoru prof. Cəfər Cəfərov konfransın keçirilməsinin əhəmiyyətindən söz açıb, universitetdə STEAM təhsili ilə bağlı həyata keçirilən tədbirlər haqqında geniş məlumat verib. Rektor qeyd edib ki, universitetdə yaradılan STEAM Mərkəzinin dəstəyi ilə 8 ixtisas üzrə STEAM fənni tədris olunur. Mərkəz son illərdə müxtəlif beynəlxalq yarış və müsabiqələrdə universiteti uğurla təmsil edib.

Elm və innovasiyalar üzrə prorektor prof. Asəf Zamanov STEAM yanaşmasının tədrisdə rolu və yeri, bu sahədə beynəlxalq təcrübə və yeniliklər haqqında geniş məlumat verərək, STEAM-in əmək bazarının tələblərinə uyğun kadrların hazırlanmasındakı əhəmiyyətindən söz açıb.

STEAM Mərkəzinin müdiri dos. Arzu Daşdəmirov burada aparılan geniş və çoxşaxəli fəaliyyət haqqında məlumat verərək qeyd edib ki, STEAM Mərkəzinin nəzdində "FabLAB" dərnəyi və "STEAMLAND" yaradılıb. ADPU-nu təmsil edən komandalar Türkiyənin Antaliya şəhərində keçirilən "Robotex" beynəlxalq robototexnika müsabiqəsində iştirak edərək I və II yerlərə layiq görülüb və Estoniyada baş tutacaq dünya çempionatına vəsiqə qazanıblar.

Daha sonra məruzələr dinlənilib. Məruzəçilər - dosent Elnurə Səfərova "Biologiya dərslərində STEAM metodologiyasının tətbiqi əhəmiyyəti", müəllim Cavid Tapdıqlı "STEAM təhsilində artırılmış və virtual reallıq", dosent Rəhimə Məmmədova "STEAM təhsilinin real dünya problemlərinin həllinə təsirlərinin araşdırılması", fizika üzrə fəlsəfə doktoru Vəfa Abdurahmanova "Fiziki dünya ilə rəqəmsal dünya arasında əlaqə. Əşyaların interneti - İoT" mövzularında geniş təqdimatla çıxış ediblər.

Sonra konfrans fəaliyyətini bölmələrdə davam etdirib.

# ADPU-da Vətən müharibəsi iştirakçısı olan tələbələrlə səmimi görüş





Oktyabrın 31-də Pedaqoji Universitetdə Vətən müharibəsi iştirakçısı olan və hazırda universitetdə təhsil alan tələbələrlə çay süfrəsi arxasında səmimi görüş keçirilib. Görüşdə ADPU-nun rektoru professor Cəfər Cəfərov, tədris işləri üzrə prorektor dosent Eldar Aslanov, sosial və humanitar məsələlər üzrə prorektor professor Fikrət Rzayev, Tədbirlərin təşkili və tələbələrlə iş şöbəsinin müdiri Turan Kərimli, İctimaiyyətlə əlaqələr və marketinq şöbəsinin müdiri Taleh Mirzəyev və 6 nəfər Vətən müharibəsi iştirakçlısı olan tələbə iştirak edib. Rektor prof. Cəfər Cəfərov tələbələri salamlayaraq, qarşıdan gələn Zəfər Günü münasibətilə təbriklərini çatdırıb. Rektor diqqətə çatdırıb ki, 44 günlük Vətən müharibəsində Pedaqoji Universitetin tələbə və məzunları da yaxından iştirak ediblər.

Universitetin yüzlərlə tələbə və məzunu döyüşlərdə iştirak edib ki, onlardan 18 nəfəri şəhid olub. 11 nəfər müharibə iştirakçısı hazırda universitetin müxtəlif fakültələrində təhsil alır. Tələbələrə döyüşlərdə göstərdikləri şücaətə və ərazi bütövlüyümüzün bərpasındakı xidmətlərinə görə təşəkkürünü çatdıran prof. C.Cəfərov universitet tərəfindən daim bu kateqoriyadan olan tələbələrin xüsusi diqqətdə saxlanıldığını vurğulayıb.

Daha sonra tələbələrin döyüş yolu və müharibə xatirələri dinlənilib. Həmçinin onların problem və təklifləri müzakirə olunaraq, zəruri dəstək tədbirləri ilə bağlı fikir mübadiləsi aparılıb.

# ADPU əməkdaşları Corc Vaşinqton Universitetində

ADPU əməkdaşları – Təlim-Tədris Mərkəzinin müdiri pedaqogika üzrə fəlsəfə doktoru Xalidə Həmidova, Ümumi coğrafiya fakültəsinin dosenti Mətanət Əsgərova, Fəlsəfə və sosial elmlər kafedrasının dosenti Nigar Qəhrəmanova, Xarici Dillər Mərkəzinin müəllimi Jalə Səmədova və Biologiya və onun tədrisi texnologiyası kafedrasın müəllimi Şəhla Abdullayeva ABŞ-nin Corc Vaşinqton Universitetində (CVU) işgüzar səfərdə olublar.

Amerika ali təhsilində tətbiq olunan müxtəlif tədris və təlim metodologiyaları ilə tanışlıq üçün nəzərdə tutulmuş strukturlaşdırılmış proqramla məşğul olmaq məqsədi daşıyan səfər Vaşinqton şəhərində yerləşən CVU-nun professor-müəllim heyəti ilə görüşlə başlanıb. Görüş çərçivəsində ABŞ təhsil təcrübəsi, dayanıqlı inkişaf və onun təhsilə inteqrasiyası, yeni tədris metodlarının və modellərinin tətbiqi, tədris prosesinin bəzi nümunələri, biliyin qiymətləndirilməsində müxtəlif metodlardan istifadə, təhsil standartlarının rolu və onun əsas prinsipləri, təhsilin inkişaf etdirilməsində yeni strategiyalar kimi mövzular ətrafında müzakirə və fikir mübadiləsi aparılıb.

5 gün davam edən səfər zamanı əməkdaşlar doktor Kolin Qrin, prof. Maykl Foyer, Maria Çes, və Sevinc Məmmədova kimi aparıcı mütəxəssislər tərəfindən keçilən müxtəlif mövzuda təlimlərdə iştirak ediblər.




Həmçinin səfər iştirakçıları universitetdə yaradılmış infrastruktur və tədris şəraiti ilə yaxından tanış olub, dərs prosesində iştirak edərək ABŞ mütəxəssislərinin tədris texnologiyaları və pedaqoji yanaşmaları ilə praktik olaraq tanış olublar.

Səfərin nəticəsi kimi Pedaqoji Universitetdə tələbələrin öyrənmə prosesinə daha aktiv cəlbi üçün praktik otaqların təşkili, Təhsildə Dayanıqlı İnkişaf Məqsədlərinin tədrisə inteqrasiyasına daha çox diqqət yetirilməsi, fəal təlim metodları ilə işin təşkilinin genişləndirilməsi, qiymətləndirmə meyarlarının təkmilləşdirilməsi kimi məsələlərdə Corc Vaşinqton Universitetinin təcrübəsindən istifadənin faydalı ola biləcəyi müəyyən edilib.

# Əməkdaşlarımız Lənkəranda təlimdə

28-30 oktyabr tarixlərində 2024-cü il üzrə Türk Dünyasının "Gənclər Paytaxtı" seçilmiş Lənkəran şəhərində Azərbaycan Gənc Alim, Doktorant və Magistrlər Cəmiyyəti, Gənclər və İdman Nazirliyinin dəstəyi ilə "Gənc tədqiqatçılar üçün "Açıq elm" yay məktəbinin təşkili" layihəsi çərçivəsində təlim keçirilib. Təlimdə ADPU-nun Gənc Alimlər və Tədqiqatçılar Şurasının sədri, filologiya üzrə fəlsəfə doktoru İlkin Əsgərov, Tarix və coğrafiya fakültəsinin müəllimi Səbinə Sadıqova, Quba filialının əməkdaşları Yadulla Ələkbərov, Sərxan Cəfərov və doktorant Amid Əliyev də iştirak ediblər.

Tədbirin rəsmi hissəsində Azərbaycan Gənc Alim, Doktorant və Magistrlər Cəmiyyətinin sədri İlqar Orucov və Lənkəran-Astara Regional Gənclər və İdman İdarəsinin sektor müdiri Kənan Musayev çıxış edərək ölkədə həyata keçirilən davamlı gənclər siyasəti və layihə çərçivəsində təşkil edilmiş təlimin əhəmiyyətindən danışıblar.

İki gün davam edən təlim zamanı müxtəlif ali məktəb və institutları təmsil edən gənc tədqiqatçılar açıq elmi resurslara



çıxış imkanları haqqında məlumatlandırılıb, elmi-tədqiqat bazalarından səmərəli istifadə metodları, indekslər və data bazalar, elmi məqalələrin hazırlanması metodları, İMRAD modeli və açıq təhsil resursları barədə informasiyaları əks etdirən təqdimatlarla tanış olublar. Həmçinin layihə çərçivəsində təlim iştirakçılarının Lənkəran şəhərində yerləşən Tarix-diyarşünaslıq muzeyi və Həzi Aslanovun ev muzeyinə ekskursiyası təşkil edilib.

# Keyfiyyət Komissiyasının iclası keçirilib



Oktyabrın 30-da ADPU-nun Keyfiyyətin təminatı şöbəsi yanında Keyfiyyət Komissiyasının və İşçi Qrupunun birgə onlayn iclası keçirilib.

Keyfiyyətin təminatı şöbəsinin müdiri dosent Qalib Şərifov iştirakçılara iclasın mahiyyəti və gündəliyi haqqında məlumat verib. Tədris işləri üzrə prorektor dosent Eldar Aslanov Fəaliyyət planı hesabatının müzakirəsini açıq elan edib və ümumi iş prosesi haqqında iştirakçıları məlumatlandırıb.

İclasın plana uyğun olaraq dos. Qalib Şərifovun İnkluziv təhsil siyasəti sənədi və ADPU-da İncəsənət və fiziki tərbiyə fakültəsinin professor-müəllim heyətinin reytinq qiymətləndirilməsi barədə təklifləri müzakirə edilib.

Sonda tələbələr arasında reytinq sorğunun aparılma forması, Monitorinq komissiyasının tərkibinin müzakirəsi və ADPU-da professor-müəllim heyətinin qiymətləndirilməsində COP 29-a görə yaranacaq 10 günlük gecikmənin müzakirəsi aparılıb.

İclasın yekununda ADPU-nun İnklüziv təhsil siyasət sənədinin, professor-müəllim heyətinin reytinq qiymətləndirilməsinin və tələbələrlə sorğunun (reytinq) aparılma formasının təkmilləşdirilməsi yönündə fikir və qeydlər ümumiləşdirilərək növbəti görüşlər üçün planlaşdırmalar aparılıb.

# Məktəbəqədər təhsil fakültəsi şəhid ailəsini ziyarət edib



Noyabrın 1-də ADPU-nun Məktəbəqədər təhsil fakültəsinin dekanı dosent Nailə Hüseynova və fakültə əməkdaşları, eləcə də Tələbə Gənclər Təşkilatı və Tələbə Həmkarlar İttifaqı Komitəsinin fakültə üzrə fəal tələbələri şəhid Hüseyn Tağıyevin ailə üzvlərini ziyarət ediblər.

Görüş zamanı yaxınları ilə birgə şəhidin döyüş yolu və onunla bağlı xatirələr yad edilib. Ziyarətçilər şəhidin ruhuna ehtiramlarını ifadə edib, şəhidlərin əziz xatirəsinin daim qəlbimizdə yaşadığını bildiriblər. Qeyd edək ki, Azərbaycan Ordusunun kiçik çavuşu olan Hüseyn Tağıyev 2020-ci il sentyabrın 27-də Azərbaycan Silahlı Qüvvələri tərəfindən Ermənistan işğalı altında olan ərazilərin azad edilməsi və Azərbaycanın ərazi bütövlüyünün bərpa edilməsi üçün başlanan Vətən müharibəsində fəallıqla iştirak edib. Füzuli istiqamətində gedən döyüşlər zamanı rayonun Alxanlı kəndinin azad olunması əməliyyatında qəhrəmancasına şəhid olan H.Tağıyev II Şəhidlər Xiyabanında dəfn olunub.

# "Naxçıvanlı elmlər doktorları" ADPU-da təqdim olundu

Dekabrın 18-də (ADPU) Kitabxana-İnformasiya Mərkəzində ADPU-nun elm və innovasiyalar üzrə prorektoru, fizika-riyaziyyat elmləri doktoru, professor Asəf Zamanovun "Naxçıvanlı elmlər doktorları" kitabının təqdimatı keçirilib. Təqdimat mərasimində elmi ictimaiyyətin nümayəndələri, eləcə də Pedaqoji Universitetin rəhbərliyi və professor-müəllim heyəti iştirak edib.

Əvvəlcə, Ümummilli Lider Heydər Əliyevin, ölkəmizin ərazi bütövlüyü uğrunda canından keçən şəhidlərimizin və Azərbaycanın elmi-ictimai tərəqqisində mühüm rol oynayan görkəmli alimlərin xatirələri bir dəqiqəlik sükutla yad edilib. Mərasimdə açılış nitqi ilə çıxış edən rektor professor Cəfər Cəfərov diqqətə çatdırıb ki, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin Sərəncamı ilə 2024-cü ildə Naxçıvan Muxtar Respublikasının 100 illik yubileyinin qeyd olunması ilə əlaqədar Tədbirlər Planı təsdiq olunub. Professor Asəf Zamanovun bu ensiklopedik əsərini də Pedaqoji Universitetin Muxtar Respublikanın 100 illiyinə dəyərli töhfəsi hesab etmək olar.

Daha sonra Azərbaycan Milli Elmlər Akademiyasının (AMEA) akademik katibi, Fizika İnstitutunun baş direktoru akademik Arif Həşimov, Azərbaycanda Atatürk Mərkəzinin rəhbəri akademik Nizami Cəfərov, AMEA-nın M.Füzuli adına Əlyazmalar İnstitutunun baş direktoru akademik Teymur Kərimli, Naxçıvan Muxtar Respublikasının Bakı şəhərindəki daimi nümayəndəliyinin rəhbəri Bəxtiyar Əsgərov, AMEA-nın N.Gəncəvi adına Ədəbiyyat İnstitutunun şöbə müdiri professor Vüqar Əhməd, ADPU-nun İbtidai təhsilin pedaqogikası kafedrasının müdiri professor Fərrux Rüstəmov və Azərbaycan



Milli Konservatoriyası nəzdində Musiqi Kollecinin direktoru professor Nazim Kazımov çıxış edərək əsərin xüsusən elm tarixi və görkəmli alimlərin irsinin öyrənilməsi baxımından müstəsna əhəmiyyət kəsb etdiyini vurğulayaraq, müəllifə bu əhatəli tədqiqata görə minnətdarlıqlarını bildiriblər.

Qeyd olunub ki, 100 ildən artıq tarixi olan Pedaqoji Universitet və onun alimləri daim milli təhsilimiz və elmimizin inkişafına dəyərli töhfələr vermişdir. Prof. A.Zamanovun sözügedən əsəri də bu kontekstdə növbəti qədirşünaslıq nümunəsi hesab oluna bilər.

Sonda çıxış edən kitabın müəllifi professor Asəf Zamanov göstərilən diqqətə görə çıxışçılara və tədbir iştirakçılarına minnətdarlığını bildirərək vurğulayıb ki, "Naxçıvanlı elmlər doktorları" əsərində ümumən 300 nəfərdən çox naxçıvanlı və əslən Naxçıvandan olan alimlər – elmlər doktorlarının həyatları və elmi yaradıcılıqları haqqında məlumat əks olunur. Bildirilib ki, kitab ilk dəfə Naxçıvan Muxtar Respublikasının 100 illiyinə həsr olunmuş konfransda təqdim olunub.

## Gələcəyin psixoloqları üçün panel müzakirə



Noyabrın 1-də Pedaqoji Universitet, Azərbaycan Respublikası Gənclər Fondu, Gənclərin İnkişafı və Karyera Mərkəzi (GİKM) və Azərbaycan Tələbə Gənclər Təşkilatları İttifaqının (ATGTİ) dəstəyi, ADPU TGT-nin təşkilatçılığı ilə psixologiya sahəsində karyera qurmaq istəyən tələbə-gənclər üçün panel müzakirə keçirilib.

Gəncləri karyera hədəflərinə yaxınlaşdırmaq və psixologiya sahəsindəki imkanların kəşf etmək barədə məlumatlılıqlarının artırılması, karyera planlamasına dəstək göstərilməsi və gənclərin şəbəkələşməsini təmin etmək məqsədilə baş tutan görüşdə çıxış edən ADPU-nun Heydər Əliyev Mərkəzinin mütəxəssisi Tərlan Ağayev, GİKM-in aparıcı mütəxəssisi Sura Əliyeva, ATGTİ-nin üzvlərlə iş üzrə meneceri Aqil Quliyev iştirakçılara tədbir haqqında ümumi məlumat verib, bu kimi layihələrin gənclərin inkişafı üçün əhəmiyyətini vurğulayıblar. Tədbirin gedişatında Mətanət Xəlilovun moderatorluğu ilə panel müzakirə təşkil olunub. Paneldə Psixologiya Elmi Tədqiqat İnstitutunun sədri, psixoloq Elnur Rüstəmov "Yeni dövr psixoloqu. Zəruri bacarıqlar və biliklər", psixoloq, NLP master və təlimçi Elmir İsgəndərov "Sektordakı iş imkanları", psixoloq Fidan Azərqızı "Universitet illərində və universitetdən sonra psixoloqun ilk 5 ildəki hədəfləri", klinik psixoloq və psixoterapevt Rövşən Nəcəfov isə"Psixoloq olmağın çətinlikləri" mövzularında çıxış edərək bu mövzularda vacib məsələləri tələbələrin diqqətinə çatdırıblar.

## ADPU-nun alim və tələbələri "İqlim Dəyişikliyi Zirvəsi"ndə



Noyabrın 1-də "Cifal İstanbul", Bağçaşəhər Universiteti, "Bilimsenol" Platforması, Azərbaycan Texniki Universiteti və universitetin Tələbə Həmkarlar İttifaqı Komitəsinin əməkdaşlığı çərçivəsində "İqlim Dəyişikliyi Zirvəsi" konfransı keçirilib.

Konfransda "Sıfır tullantı" panelində çıxış edən ADPU-nun Kimya və biologiya fakültəsinin dekanı dosent Reyhan Ağayeva tullantıların idarə olunması, səmərəli geridönüş, ətraf mühitə daha həssas gəncliyin yetişdirilməsində təhsil prosesinin rolundan və görülən işlərdən danışıb. "İqlim dəyişikliyi. Yaşıl enerji" panelində çıxış edən fakültənin dekan müavini dos. Bəsti Əsədova isə iqlim böhranları, onlarla mübarizə tədbirləri və ekosistemlərin qorunması yolları ilə bağlı məsələlərə toxunub.

Türkiyə və Azərbaycanın elm xadimləri, mütəxəssislər və ətraf mühit fəallarının iştirak etdiyi tədbirdə, həmçinin ADPU-nun Kimya və biologiya fakültəsinin tələbələrinin "Yaşıl dünya naminə həmrəylik ili" və COP29 münasibətilə ətraf mühitin qorunmasını təbliğ etmək məqsədilə tullantı məhsullarından hazırladıqları eksponatlardan ibarət "Atma, Yarat, Faydalan" adlı ekosərgi də nümayiş olunub.

# Mahirə Nağıqızının yaradıcılıq gecəsi





Noyabrın 2-də Beynəlxalq Muğam Mərkəzində Qərbi Azərbaycan İcmasının təşkilatçılığı ilə tanınmış alim və pedaqoq, istedadlı şair və ictimai xadim, ADPU-nun beynəlxalq əlaqələr üzrə prorektoru professor Mahirə Hüseynovanın (Nağıqızı) yaradıcılığına həsr edilmiş poeziya gecəsi keçirilib. AZƏRTAC xəbər verir ki, tədbirdə əvvəlcə Mahirə Nağıqızının həyat və fəaliyyətini özündə əks etdirən videoçarx nümayiş olunub.

Sonra tədbirdə çıxış edən Qərbi Azərbaycan İcmasının Qadınlar Şurasının sədri, Milli Məclisin deputatı Məlahət İbrahimqızı Mahirə Nağıqızının zəngin söz dünyasından, yaradıcılığının özünəməxsus cəhətlərindən danışıb, onun pedaqoq, istedadlı şair, vətənpərvər ziyalı və tanınmış alim olduğunu bildirib.

"Mahirə xanımın yaradıcılığında müxtəlif mövzular əks olunur. Bunlar vətən sevgisi, təbiət, ilahi məhəbbət, insanın ruh aləmi mövzularıdır. Lakin onun poeziyasında ən diqqətçəkən məqamlardan biri Vətənə olan sevgisidir. O, Vətən torpağının hər qarışını sevgi ilə tərənnüm edir. Mahirə xanımın yaradıcılığında Qarabağın 30 il müddətində işğal altında olduğu dövrdə elə bir guşəsi yoxdur ki, onunla bağlı şeir və ya hekayəsi olmasın. Bu gün isə artıq Qarabağ azaddır, Azərbaycanın ərazi bütövlüyü bərpa olunub və bu tarixi zəfər Mahirə xanımın yaradıcılığında yeni bir mərhələnin başlanğıcıdır", – deyə M.İbrahimqızı diqqətə çatdırıb. Tədbirdə digər çıxış edənlər Azərbaycan Milli Elmlər Akademiyasının prezidenti, akademik İsa Həbibbəyli, ADPU-nun rektoru professor Cəfər Cəfərov, Azərbaycan Atatürk Mərkəzinin direktoru akademik Nizami Cəfərov, Milli Məclisin deputatı Hikmət Babaoğlu Mahirə xanımın yaradıcılığı haqqında fikirlərini bölüşüblər. Bildirilib ki, Mahirə xanım bu gün elmi fəaliyyəti ilə bərabər, ölkənin ictimai həyatında da fəal iştirak edir. Onun Qərbi Azərbaycan İcmasının fəaliyyətində də çox böyük əməyi var və Qərbi Azərbaycan həqiqətlərinin ölkə daxilində və xaricində təşviq edilməsi istiqamətində intensiv fəaliyyət göstərir. Çıxış edənlər vurğulayıblar ki, çoxşaxəli və məhsuldar fəaliyyəti ilə tanınan professor 60-dan çox elmi əsərin, monoqrafiyanın, tədqiqat əsərlərinin müəllifidir. Bildirilib ki, bu əsərlərin bir çoxu müxtəlif dillərdə, xarici ölkələrdə nəşr edilib və tədris edilir. Qeyd edək ki, müasir Azərbaycan poeziyasında imzası ilə tanınan və sevilən şair Mahirə Nağıqızı Türk dünyasının bir sıra universitetlərinin fəxri professorudur. Onun 70-dən çox şeirinə musiqi bəstələnib.

Tədbirdə şairin müəllifi olduğu şeirlər səsləndirilib. Sonda çıxış edən Mahirə Nağıqızı təşkil olunmuş gecəni öz yaradıcılığının hesabatı kimi dəyərləndirib, elmi fəaliyyətinə göstərilən diqqətə görə minnətdarlığını bildirib. Tədbir bədii hissə ilə davam edib.

Qeyd edək ki, ədəbiyyatşünas alim, elm və maarif təşkilatçısı kimi Mahirə xanım həm də Qərbi Azərbaycan Televiziyasında "Ziyalı" elmi-publisistik verilişin müəllifidir.

## ADPU-da maraqlı intellektual oyun: tələbə və məzunlar birgə yarışdılar



Noyabrın 3-də ADPU TİİK və ADPU Gənc Məzunlar Assosiasiyasının (ADPU GMA) birgə təşkilatçılığı ilə "Yaşıl dünya naminə həmrəylik ili" çərçivəsində intellektual yarış keçirilib. Yarışdan əvvəl ADPU GMA üzvü olan məzunlar və Assosiasiyanın İdarə Heyətinin üzvləri intellektual oyunlarda yaşadıqları maraqlı təcrübələri tələbələrlə bölüşüb, onlara dünyagörüşü və intellektual inkişafları üçün faydalı olacaq məsləhətlər veriblər. Sonra məzunlar və tələbələrdən ibarət komandaların iştirakı ilə "Nə? Harada? Nə zaman?" formatında intellektual oyun keçirilib. Maraqlı mübarizə şəraitində keçirilən 24 suallıq intellektual yarışın nəticələrinə əsasən qalib olan komandalar kitabla mükafatlandırılıblar.

Sonda ADPU TİİK sədri Camilə Qurbanova təşəbbüskarlıq və əməkdaşlığa görə ADPU-nun Gənc Məzunlar Assossasiyasının sədri Eltac Cəbiyevə, yarışın keçirilməsində təşkilati dəstək göstərdiyinə görə Xəzər İntellektual Gənclər Klubunun rəhbəri, ADPU-nun məzunu Azad Manafliya təşəkkür edib, qonaqlara hədiyyələr təqdim olunub.

## Zəfər Günü qeyd olundu - "Qələbə Ruhunu Yaşat"



Noyabrın 4-də ADPU TİİK-nın təşkilatçılığı ilə Zəfər Gününə həsr olunmuş "Qələbə Ruhunu Yaşat!" mövzusunda bədii tədbir keçirilib. Tədbirdən öncə Pedaqoji Universitetin rəhbərliyi, eləcə də ADPU-nun 44 günlük Vətən müharibəsi və sonrakı dövrdə şəhid olan tələbə və məzunlarının bir qisminin ailə üzvləri universitetin foyesində şəhidlərin xatirəsini əbədiləşdirmək məqsədilə yaradılmış "Zəfər guşə"sini ziyarət edərək şəhidlərin əziz xatirəsini ehtiramla yad edib, abidə önünə tər çiçəklər qoyublar. Ardınca "Zəfər stendi" və ADPU-nun Heydər Əliyev muzeyi ziyarət olunub. Universitet rəhbərliyi və müvafiq struktur rəhbərləri, şəhid tələbə və məzunların ailə üzvləri, qazilər və tələbələrin iştirak etdiyi tədbiri giriş sözü ilə açan ADPU TİİK sədri Camilə Qurbanova qarşıdan gələn Zəfər Günü münasibətilə tədbir iştirakçılarını təbrik edib. Tədbirdə iştirak edən şəhid ailələrinə iştirakları üçün minnətdarlığını bildirən C.Qurbanova şəhidlərimizin əziz xatirəsinin daim qəlbimizdə yaşadığını qeyd edib. Möhtəşəm qələbəmizi, ərazi bütövlüyümüz, suverenliyimiz və sabitliyimizi ilk növbədə Müzəffər Ali Baş Komandan İlham Əliyevin rəhbərliyi altında olan rəşadətli Azərbaycan Orusuna, qəhrəman şəhid və qazilərimizə borclu olduğumuzu qeyd edən ADPU TİİK sədri tələbə-gəncləri tarixi unutmamağa, qalib xalqın gəncliyi olaraq üzərlərinə düşən məsuliyyəti dərk edərək XXI əsrin rəqəmsal dünyasında öz vətəndaş mövqelərini ortaya qoymağa səsləyib. Tədbirin bədii hissəsində tələbələr tərəfindən hazırlanmış vətənpərvərlik ruhundakı milli musiqi və rəqs nömrələri nümayiş olunub, müxtəlif tarixi qəhrəmanlıq səhnələri və kompozisiyalar təqdim edilib.Daha sonra Vətən müharibəsində şəhid olan ADPU-nun tələbə və məzunlarına həsr edilmiş videoçarx nümayiş etdirilib.Tədbirin yekununda ADPU-nun rektoru professor Cəfər Cəfərov vətənpərvərlik ruhunun təbliğinə yönəlmiş tədbirin təşkilində əməyi olan tələbələrə təşəkkürünü bildirib, şəhid yaxınları və qazilərə zaman ayıraraq tədbirdə iştirak etdikləri üçün təşəkkür edib. Rektor Pedaqoji Universitet adından hazırlanmış gül dəstələrini şəhid yaxınlarına təqdim edib.

## "Zəfərnamə" təqdim edildi – şəhid tələbə və məzunların ailələri ilə görüş

Noyabrın 4-də ADPU-nun 44 günlük Vətən müharibəsində şəhid olmuş tələbə və məzunlarının bir qisminin ailə üzvləriylə görüş keçirilib.

Görüşdə ADPU-nun rektoru professor Cəfər Cəfərov, tədris işləri üzrə prorektor dosent Eldar Aslanov, sosial və humanitar məsələlər üzrə prorektor professor Fikrət Rzayev, Tədbirlərin təşkili və tələbələrlə iş şöbəsinin müdiri Turan Kərimli, İctimaiyyətlə əlaqələr və marketinq şöbəsinin müdiri Taleh Mirzəyev, eləcə də Pedaqoji Universitetin tələbə və məzunu olan Vətən müharibəsi şəhidləri Firdovsi Tahirov, Əli Ələsov, Tural Dəmirçiyev, Ceyhun Nüsrətli, Elgün Əzizov və Elvin Zakirovun yaxınları iştirak ediblər.

Prof. Cəfər Cəfərov şəhid ailələrini salamlayaraq dəvəti qəbul edərək görüşdə iştirak etdikləri üçün təşəkkürünü bildirib. Vətənin ərazi bütövlüyünün təmin edilməsi və dövlət suverenliyinin bərpası yolunda canlarından keçmiş şəhidlərimizin ruhuna ehtiramını ifadə edən rektor, qarşıdan gələn Zəfər Günü münasibətilə onları təbrik edib. C.Cəfərov bu mühüm tarixi qələbinin memarları olan, canları bahasına bizi Qarabağa qovuşduran qəhrəmanlar yetişdirən valideynləri, onların ailə üzvlərini Pedaqoji Universitetdə görməkdən böyük fəxarət və məmnunluq duyduğunu bildirib. Şəhidlərimizin 30 ildən artıq müddətdə həsrətini çəkdiyimiz doğma torpaqlara qovuşmağımızda misilsiz xidmətlərini vurğulayan prof. C.Cəfərov bildirib ki, bu tarixi Zəfər məhz xalqımızın bu cür mərd övladlarından ibarət Müzəffər Ordunun və onun Müzəffər Ali Baş Komandanın birliyinin nəticəsidir.

Rektor diqqətə çatdırıb ki, Pedaqoji Universitetin yüzlərlə tələbə və məzunu da Vətən müharibəsində aktiv şəkildə iştirak edib, 18 nəfər tələbə və məzunu qəhrəmancasına şəhidlik zirvəsinə ucalıb. Qeyd edilib ki, Universitet tərəfindən şəhid tələbə və məzunların əziz xatirəsinin əbədiləşdirilməsi daim diqqət mərkəzində saxlanılır. Universitetin əsas tədris binasının II və III mərtəbələrində şəhidlərin xatirə guşələri yaradılıb, "Pedaqoji Universitetin Qəhrəmanları" ensiklopedik toplusunda şəhidlərə aid bölməyə geniş yer ayırılıb.

Daha sonra öz təəssüratlarını bölüşən şəhidlərin ailə üzvləri qəhrəman oğullarımızın keçdikləri şərəfli həyat və ömür yolundan söz açıb, öz xatirələrini bölüşüblər.

Görüşdə, həmçinin İctimaiyyətlə əlaqələr və marketinq şöbəsinin müdiri Taleh Mirzəyevin müəllifi olduğu və yeni çapdan çıxmış "Zəfərnamə (ADPU-nun qəhrəmanları)" kitabı ilk olaraq şəhid ailələrinə təqdim edilib.

Qeyd edək ki, əsər "Pedaqoji Universitetin Qəhrəmanları" ensiklopedik toplusu əsasında hazırlanmış təkmil və yığcam nəşrdir. Kitabda müxtəlif dövrlərdə ADPU-nun, onun filialları və







tərkibindəki Pedaqoji Kollecin tələbə və məzunları olmuş, habelə universitetə rəhbərlik etmiş ümumilikdə 60 nəfərədək şəxs haqqında məlumat təqdim edilir. Onlardan 8 nəfəri İkinci Dünya müharibəsi iştirakçısı (4 nəfəri Sovet İttifaqı Qəhrəmanı, 4 nəfəri ADPU-nun rektoru (onların 2-i həm də ADPU-nun məzunudur)), 3 nəfəri Azərbaycanın Milli Qəhrəmanı, 1 nəfəri "Zəfər" Ordeni ilə, 4 nəfəri "Azərbaycan Bayrağı" Ordeni ilə təltif edilmiş, 29 nəfəri (onlardan 7 nəfəri ADPK-nın tələbə və məzunlarıdır) Birinci Qarabağ müharibəsi şəhidi, 18 nəfəri (onlardan 2 nəfəri Şamaxı filialının, 2 nəfəri Ağcabədi filialının, 5 nəfəri ADPK-nın tələbə və məzunlarıdır) Vətən müharibəsi şəhididir.

"Zəfərnamə" əsəri "İkinci Dünya müharibəsi iştirakçıları. Sovet İttifaqı Qəhrəmanları", "İkinci Dünya müharibəsi iştirakçıları. Döyüşən rektorlarımız", "Azərbaycanın Milli Qəhrəmanları", ""Zəfər" Ordeni ilə təltif edilənlər", "Məzun sərkərdələrimiz - generallar", ""Azərbaycan Bayrağı" Ordeni ilə təltif edilənlər", "Birinci Qarabağ müharibəsi şəhidləri" və "Vətən müharibəsi şəhidləri" kimi 8 məntiqi ardıcıl bölməyə ayrılır. "Vətən müharibəsi şəhidləri" bölməsində 44 günlük müharibədə şəhid olmuş ADPU-nun tələbə və məzunları haqqında müfəssəl məlumatlar yer alır.

## ADPU tələbələri şəhid məzunların ailələrini ziyarət ediblər

Noyabrın 5-də ADPU TKTB-nin fəal tələbələri Universitetin 44 günlük Vətən müharibəsində şəhid olmuş tələbəsi, "Azərbaycan Bayrağı" ordenli Firdovsi Tahirovun ailəsini ziyarət ediblər. Görüş zamanı valideynləri Firdovsi haqqında xatirələrini tələbələrlə bölüşüb, keçdiyi döyüş yolu barədə söz açıblar.

Tələbələr şəhidlərin ruhuna dərin ehtiramlarını ifadə edib, onların uca xatirələrini daim yaşatmağın gənclərin qarşılarında böyük missiya olduğunu bildiriblər.



F.Tahirovun yaxınları ziyarət üçün tələbələrə təşəkkür edib və övladlarının xatirəsinin gənclər tərəfindən yaşadılmasından məmnunluqlarını bildiriblər.

1997-cui ildə Lerik rayonunun Dico kəndində anadan olan Firdovsi Balaxan oğlu Tahirov 2015-2019-cu illərdə ADPU-nun Tarix müəllimliyi ixtisasında təhsil alıb. 2020-ci ilin 27 sentyabrında başlanan Vətən müharibəsinin ilk günündə Murovdağ istiqamətində gedən döyüşlərdə qəhrəmancasına şəhid olan F.Tahirov göstərdiyi qəhrəmanlığa görə ölümündən sonra "Azərbaycan Bayrağı" ordeni, "Vətən uğrunda", "Cəsur döyüşçü" və "Kəlbəcərin azad olunmasına görə" medalı ilə təltif edilib. Eyni zamanda ADPU TKTB fəalları Pedaqoji Universitetin şəhid məzunu Tural Dəmirçiyevin ailəsi və yaxınları ilə də görüşüblər. Tələbələr Turalın yaxınlarından onunla bağlı xatirələri dinləyib, döyüş yolu ilə tanış olublar. Şəhidin ailəsinə ehtiramlarını ifadə edən tələbələr Turalın timsalında dövlətimizin ərazi bütövlüyü və suverenliyimizin bərpası uğrunda canlarından keçən bütün şəhidlərimizin xatirəsinin xalqımızın qəlbində əbədi yaşayacağını bildiriblər. Qeyd edək ki, Dəmirçiyev Tural Rəfail oğlu 1999-cu ildə Sabunçu rayonunun Ramana qəsəbəsində anadan olub. O, 2010-2014-cü illərdə ADPU-nun Menecment ixtisasında təhsil alıb. 2020-ci ilin oktyabrın 5-də Füzuli rayonu istiqamətində əks-hücum əməliyyatında qəhrəmanlıqla şəhid olan Tural ölümündən sonra "Vətən uğrunda" və "Füzulinin azad olunmasına görə" medalları ilə təltif edilib.

# ADPU-da şəhid və qazi ailəsinin üzvü olan tələbələrin təhsil haqqı borcları silinir

Noyabrın 4-də ADPU Elmi Şurasının 2024/2025-ci tədris ili üçün növbəti iclası keçirilib.

İclası giriş sözü ilə açan Elmi Şuranın sədri, Pedaqoji Universitetin rektoru professor Cəfər Cəfərov ötən Elmi Şuradan sonrakı dövrdə elmi ad almış universitet əməkdaşları – filologiya üzrə fəlsəfə doktoru Yeganə Qasımova, kimya üzrə fəlsəfə doktoru Kəmalə İsgəndərova, aqrar elmlər üzrə fəlsəfə doktoru Fazil Cəfərov, tarix üzrə fəlsəfə doktoru Habil Həsənov, pedaqogika üzrə fəlsəfə doktoru Könül Mahmudova, pedaqogika üzrə fəlsəfə doktoru Maya Qasımova və pedaqogika üzrə fəlsəfə doktoru Umhani Məmmədovaya dosent attestatlarını təqdim edib. O cümlədən, universitetdə uzun illər elmi-pedaqoji fəaliyyətinə görə Fəlsəfə və sosial elmlər kafedrasının dosenti Telman Haqverdiyev və Riyaziyyatın ibtidai kursunun tədrisi texnologiyası kafedrasının baş müəllimi Zaman Məmmədov təşəkkürnamə ilə təltif edilib.

Rektor Cəfər Cəfərov ötən dövr ərzində universitetin struktrurları tərəfindən icra edilmiş layihələr, həyata keçirilən tədbirlər və universitet əməkdaşlarının işgüzar səfərlərinin nəticələri barədə məlumat verib. Qeyd edilib ki, bu müddət ərzində universitet bir sıra beynəlxalq konfranslar və böyük tədbirlərə ev sahibliyi edib, İstanbul Universiteti və Moskva Dövlət Pedaqoji Universiteti ilə əməkdaşlıq müqaviləsi imzalanıb, Moskva Dövlət Pedaqoji Universiteti və Polşanın Rzeszow Universitetinin nümayəndələri ADPU-da olublar. Rektor diqqətə çatdırıb ki, COP29-la bağlı universitetdə təşkil edilən silsilə tədbirlər cari müddətdə də uğurla davam etdirilib. Tələbə təşkilatları tərəfindən bu və digər istiqamətlərdə çoxsaylı layihə və tədbirlər həyata keçirilib.





Daha sonra Keyfiyyətin təminatı şöbəsinin müdiri dosent Qalib Şərifov ADPU-nun institusional akkreditasiyasının nəticəsi olaraq Akkreditasiya Komissiyasının Yekun Hesabatında verdiyi tövsiyə və göstərişlərin icrasına dair Fəaliyyət planının həyata keçirilməsi vəziyyəti barədə məruzə ilə çıxış edib. Q.Şərifov bildirib ki, Fəaliyyət planına əsasən son 6 ayda görülən işlərlə bağlı Keyfiyyətin Təminatı şöbəsinin əməkdaşları tərəfindən müvafiq şöbələrdə monitorinqlər aparılıb və nəticələr təhlil edilib. Strateji İnkişaf, keyfiyyət təminatı, təlim və tədris, elmi tədqiqat, idarəetmə sistemi, infrasturuktur, beynəlmiləlləşmə istiqamətləri üzrə tövsiyyələrin icra vəziyyəti barədə məlumatlar Şura üzvlərinə təqdim edilib.

Eyni zamanda, dos. Qalib Şərifov ADPU-nun İnklüziv təhsil siyasəti sənədinin təsdiqi barədə arayış təqdim edib.

Çıxış edən elm və innovasiyalar üzrə prorektor professor Asəf Zamanov elmi dərəcəsi olmayan mütəxəssislərin SABAH magistratura səviyyəsində dərs aparmasına icazə verilməsi, elmi rəhbərlərin dəyişdirilməsi, professor və dosent elmi adlarının verilməsi üçün AAK qarşısında vəsatət qaldırılması barədə, Tədris departamentinin direktoru dosent Sənan Əliyev 2025/2026-cı tədris ili üçün tələbə qəbulu üzrə proqnoz yerlərinin layihəsinin təsdiqi barədə məruzə ilə çıxış ediblər. Rektorun müşaviri Ümid Mehdiyev "ADPU-da Lütfi Zadə adına adlı təqaüdün verilməsi Qaydaları"nın təsdiqi, şəhid və qazi ailə üzvü olan tələbələrin təhsil haqqı borclarının silinməsi barədə Maliyyə komissiyasının təkliflərini irəli sürüb. Təklif səs çoxluğu ilə qəbul edilib.

Sonda səsverməyə çıxarılan məsələrin nəticələrinə aid hesablama komisiyasının hesabatı təqdim edilib.

## ADPU-nun şəhid məzunu baş leytenant Etiram Hüseynlinin ailəsi ziyarət olunub



Noyabrın 5-də ADPU-nun Cəlilabad filialının direktoru dosent Xudayar Sultanlı və filialın professor-müəllim heyəti universitetin məzunu olan Vətən müharibəsi şəhidi baş leytenant Etiram Hüseynlinin ailəsini və məzarını ziyarət ediblər. Görüş zamanı direktor dos. X.Sultanlı şəhidin yaxınlarını ADPU ailəsi adından qarşıdan gələn Zəfər Günü münasibətilə təbrik edib, bu qürur dolu günləri bizə yaşadan, ərazi bütövlüyümüzü və suverenliyimizi təmin edən qəhrəman şəhidlərimizin ruhuna ehtiram ifadə edib.

Direktor Pedaqoji Universitet tərəfindən şəhid məzun və tələbələrin xatirəsinin əbədiləşdirilməsinin daim diqqət mərkzində saxlanıldığını qeyd edib. Görüş zamanı Pedaqoji Universitet adından yeni çapdan çıxmış, Ehtiram da daxil olmaqla ADPU-nun Vətən müharibəsi və ondan sonrakı dövrdə şəhid olmuş tələbə və məzunlarının həyatı və döyüş yolu haqqında məlumatların əks olunduğu "Zəfərnamə (ADPU-nun qəhrəmanları)" adlı kitab ailəyə təqdim edilib. Sonra filaial kollektivi ailə ilə birgə şəhidin məzarını və xatirəsini əbədiləşdirmək məqsədilə yaradılmış guşəni ziyarət edib, məzarı üzərinə tər güllər qoyublar. Qeyd edək ki, Etiram Həsən oğlu Hüseynli 1977-ci il aprelin 17-də Lənkəran şəhərində anadan olub. 1994-cü ildə ADPU-nun İlkin hərbi və fiziki təlim fakültəsinə qəbul olunub, 1998-ci ildə təhsilini leytenant rütbəsi ilə başa vuraraq məzunu olduğu Lənkəran şəhər 6 saylı orta məktəbdə pedaqoji fəaliyyətə başlayıb. Azərbaycan Ordusunun baş leytenantı olan Etiram Hüseynli 2020-ci il sentyabrın 27-də Azərbaycan Silahlı Qüvvələri tərəfindən Ermənistan işğalı altında olan ərazilərin azad edilməsi və Azərbaycanın ərazi bütövlüyünün bərpa olunması üçün başlanan Vətən müharibəsi zamanı Cəbrayılın və Qubadlının azadlığı uğrunda gedən döyüşlərdə vuruşub. Etiram oktyabrın 21-də Qubadlı döyüşləri zamanı şəhid olub. Lənkəran şəhərində dəfn olunub. Ailəli idi. Bir oğlu yadigar qalıb. Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin müvafiq sərəncamlarına əsasən baş leytenant Etiram Hüseynli ölümündən sonra "Vətən uğrunda", "Cəbrayılın azad olunmasına görə" və "Qubadlının azad olunmasına görə" medalları ilə təltif edilib.

## ADPU tələbələrinin Bakı Avropa Liseyində rəqəmsal təcrübəsi



Azərbaycan Respublikası Elm və Təhsil Nazirliyinin "Aqoritmika" beynəlxalq riyaziyyat və proqramlaşdırma məktəbi ilə birgə həyata keçirdiyi "Cod for Future" layihəsi çərçivəsində Pedaqoji Universitetin İnformatika müəllimliyi və Riyaziyyat və informatika müəllimliyi üzrə IV və V kurs tələbələri üçün Bakı Avropa Liseyinə ekskursiya təşkil edilib.

Ekskursiya zamanı ADPU tələbələri liseyin müasir tədris şəraiti, Bakı üzrə fəaliyyət göstərən Bakı Avropa Liseyi STEAM Mərkəzi, onlayn tədbir və video görüşlərin təşkili üçün nəzərdə tutulmuş konfrans zalı və kitabxana ilə tanış olublar. Tələbələr liseydə tədris olunan "Rəqəmsal bacarıqlar" dərslərində iştirak edərək tədris prosesini müşahidə ediblər. Onlar dərs prosesi ərzində şagirdlərlə müzakirələr aparıb, fənnin tədrisinə dair praktik səriştələrə yiyələniblər.

Görüş zamanı Bakı Avropa Liseyinin rəqəmsal idarəetmə üzrə direktor müavini Rahilə Əliyarzadə tərəfindən tələbələrə "Texnologiyalar sahəsində qadınlara dəstək" İctimai Birliyi - "FEMMES DIGITALES" və "Azərbaycan Qadınları İT-də Mükafatları - AWITA" haqqında ətraflı məlumat verilib. Tələbələrin sualları cavablandırılıb.

## Tələbələrimiz Zəfər Gününü qeyd ediblər



ADPU-nun Filologiya fakültəsində Meh ədəbi dərnəyinin təşkilatçılığı ilə "Zəfər yolumuz, zəfər günümüz və ədəbiyyatımız (Mahirə Nağıqızının yaradıcılığı əsasında)" adlı seminar keçirilib. Seminarda ADPU-nun beynəlxalq əlaqələr üzrə prorektoru professor Mahirə Hüseynova, Filologiya fakültəsinin dekanı dosent Könül Həsənova və tələbələr iştirak ediblər. Məruzələrdən əvvəl Meh ədəbi dərnəyinin üzvləri tərəfindən hazırlanmış "8 Noyabr - Zəfər Günü" təqdimatı nümayiş olunub. Ədəbiyyat kafedrasının professoru Təyyar Cavadovun "Zəfər yolumuz, zəfər günümüz və ədəbiyyatımız (Mahirə Nağıqızının yaradıcılığı əsasında)" adlı məruzəsində prof. Mahirə Nağıqızının (Hüseynova) əsərlərində vətənpərvərlik və zəfər motivlərinin təhlili təqdim edilib.

Müzakirələrlə davam edən elmi seminarın sonunda prof. Təyyar Cavadov məruzənin dərc olunduğu "Azərbaycan" ədəbi-bədii jurnalını prof. Mahirə Hüseynovaya hədiyyə edib. Eyni zamanda ADPU Tələbə Gənclər Təşkilatı (ADPU TGT) tərəfindən Zəfər Günü münasibəti ilə noyabrı 6-da 2 tədbir keçirilib. TGT-nin SABAH qrupları və İbtidai təhsil fakültəsi təşkilatlarının və Debat Klubunun əməkdaşlığı ilə 8 Noyabr - Zəfər Gününə həsr olunan "Zəfər bizim gözümüzdən" adlı master-klass keçirilib. Master-klass zamanı tələbələr kətan üzərində zəfərimizi əks etdirən müxtəlif illüstrasiyalar təsvir edərək əl işlərini nümayiş etdiriblər. Həmçinin, təşkilatın Tarix və vətənpərvərlik klubunun təşkilatçılığı ilə vətənpərvərlik ruhunun təbliği məqsədilə tələbələr üçün "Yarımçıq xatirələr" filminin nümayişi təşkil edilib.



## İqlim dəyişmələrinin azaldılmasına xidmət edən EKOetik davranışlar



Noyabrın 5-də ADPU-nun Kimya və biologiya fakültəsinin dəstəyi, ADPU TGT-nin təşkilatçılığı ilə COP29-la bağlı "İqlim dəyişmələrinin azaldılmasına xidmət edən EKOetik davranışlar" mövzusunda görüş keçirilib.

Görüşün qonağı "Təmiz Şəhər" ASC-nin şöbə müdiri, AZTV-də yayımlanan "EKOetika" TV layihəsinin müəllifi və aparıcısı Orxan Cabbarlı olub.

Açılış nitqi ilə çıxış edən ADPU-nun sosial və humanitar məsələlər üzrə prorektoru professor Fikrət Rzayev ekoloji problemlərin qlobal vüsət aldığı müasir dövrdə təbii ətraf mühitin mühafizəsi və ekoloji maarifləndirməyə xidmət edən bu cür layihələrin olduqca vacib əhəmiyyətə malik olduğunu bildirib. Ölkəmizin Birləşmiş Millətlər Təşkilatının İqlim Dəyişmələri üzrə Çərçivə Konvensiyasının Tərəflər Konfransı olan COP29 kimi böyükmiqyaslı tədbirə ev sahibliyi etməyə hazırlaşdığı vaxtda gənclərin təşəbbüskarlığından məmnunluq duyduğunu bildirən prof. F.Rzayev Pedaqoji Universitetin bu cür təşəbbüsləri daim dəstəkləməyə açıq olduğunu diqqətə çatdırıb.

Görüşdə Orxan Cabbarlı təbiət və ekoloji mühit üçün fəsadlar törədən davranışlar barədə geniş təqdimatla çıxış edib. O.Cabbarlı tələbələrə öz tövsiyələrini verərək, təbiətlə etik davranmanın qaydalarından söz açıb.

## Milli Qəhrəmanın tələbə qızı atasının məzarı önündə - ADPU-da Zəfər silsiləsi



Universitetin fakültə və filiallarında Zəfər Günü münasibətilə silsilə tədbirlər keçirilib.

İbtidai təhsil fakültəsinin rəhbərliyi, professor-müəllim heyəti və tələbələri İkinci Fəxri Xiyabanı ziyarət edərək, ölkəmizin suverenliyi və ərazi bütövlüyü uğrunda canından keçmiş şəhidlərin məzarları üzərinə tər çiçəklər düzüblər. Azərbaycanın Milli Qəhrəmanı Şükür Həmidovun fakültənin III tədris ili tələbəsi olan qızı Əzizə Həmidova tələbə yoldaşları və müəllimləri ilə birgə atasının məzarını ziyarət edib, qəhrəman vətən oğullarının əziz xatirələri ehtiramla yad olunub.

Tarix və coğrafiya fükültəsində də fakültə və Tərəqqi dərnəyinin təşkilatçılığı ilə 44 günlük Vətən müharibəsinə həsr olunmuş "Şanlı Zəfər" adlı tədbir keçirilib.

Tədbirdə fakültə rəhbərliyi, universitetin tələbəsi, 44 günlük Vətən müharibəsi iştirakçısı Elşad Kərimov, şəhid yaxınları və tələbələr iştirak ediblər.

Rəsmi çıxışlardan sonra tədbir tələbələrin milli-vətənpərvərlik ruhunda hazırladıqları şeir və musiqi nömrələri, səhnəciklərin nümayişi ilə davam edib.

Universitetin SABAH Mərkəzinin təşkilatçılığı ilə "Əbədi Zəfər" adlı tədbir təşkil edilib. Tədbirin qonağı olan Aprel və II Qarabağ müharibəsi iştirakçısı, ehtiyatda olan polkovnik-leytenant Vüsal Nağıyev II Qarabağ müharibəsi ilə bağlı öz təsüratlarını bölüşüb. Daha sonra tələbələr tərəfindən hazırlanmış səhnəcik nümayiş etdirib.

İncəsənət və fiziki tərbiyə fakültəsində keçirilən Zəfər Günü tədbiri fakültənin tələbələrindən ibarət xor kollektivinin ifasında Dövlət Himninin səsləndirilməsi ilə başlanılıb. Fakültənin dekanı sos.ü.f.d Anar Fərmayılov və professor-müəllim heyətinin üzvləri Vətən müharibəsinin tarixi, Azərbaycan Ordusunun misilsiz qəhrəmanlığı, Ali Baş Komandan, ordu və xalq birliyinin gücü mövzularında çıxışlar ediblər. ADPU-nun filiallarında da şanlı Zəfərimiz böyük təntənə ilə qeyd edilib.

Ağcabədi filialında Zəfər Günü münasibətilə "Mənim Azərbaycanım, adına zəfər yaraşır" mövzusunda elmi-praktik konfrans keçirilib. Konfransdan əvvəl Ulu Öndər Heydər Əliyevin büstü önünə gül dəstələri qoyub, rayonun Şəhidlər Xiyabanı ziyarət ediərək vətən uğrunda canlarından keçən şəhidlərin xatirələri edilib.

Filial rəhbərliyi, professor-müəllim heyəti və tələbələrin iştirak etdiyi elmi-praktik konfransda Vətən müharibəsi, Zəfərin hərbi və tarixi aspektlərini özündə əks etdirən mühazirə və çıxışlar dinlənilib. Konfransın gedişində tələbələr tərəfindən "Xudayar təsnifi" ifa edilib. Şəki filialının rəhbərliyi, professor-müəllim heyəti və tələbələr şəhərin Şəhidlər Xiyabanını ziyarət ediblər. Həmçinin, Vətən müharibəsi şəhidi Şahmar Soltanlı və Eltun Kərimovun ailələri filial əməkdaşları tərəfindən ziyarət edilib. Eyni zamanda, Zəfər Günü münasibətilə tədbirlər təşkil edilib. Şamaxı filialında isə 8 Noyabr – Zəfər Gününə həsr olunmuş "Xarı bülbül qoxulu Zəfər" adlı tədbir keçirilib. Tədbirdən əvvəl filialın həyətyanı sahəsində filialın şəhid məzunlarına həsr olunmuş güşə ziyarət olunub, ardınca tələbələrin əl işlərindən ibarət Zəfər Gününə həsr olunmuş sərgiyə baxış keçirilib. Rəsmi çıxışlardan sonra tədbir milli-vətənpərvərlik ruhlu musiqi və rəqs nömrələri ilə davam edib.

## "Ekoloji sivilizasiyanın astanasında: Yaşıl enerjiyə keçid" kitabının təqdimatı



ADPU-da Kimya və biologiya fakültəsinin təşəbbüsü ilə COP29 münasibətilə "Ekoloji sivilizasiyanın astanasında: Yaşıl enerjiyə keçid" kitabının təqdimatı keçirilib. Təqdimat çərçivəsində kitabın müəllifləri, - Rusiya Prezident Akademiyasının professoru Nizami Məmmədov və akademik Yusif Məmmədəliyevin qızı, AMEA-nın müxbir üzvü professor Sevda Məmmədəliyeva universitetin qonağı olublar.

Tədbirdən əvvəl ADPU-nun rektoru professor Cəfər Cəfərov qonaqları universitetdə yaradılmış infrastrukturla tanış edib, qonaqlar Kimya və biologiya fakültəsində yaradılan Y.Məmmədəliyev adına auditoriyada olublar. Təqdimat mərasimində açılış sözü ilə çıxış edən ADPU-nun rektoru prof. Cəfər Cəfərov bu il ölkəmizdə keçiriləcək və artıq hazırlıq prosesi yekunlaşmaqda olan dünyamiqyaslı COP29 konfransının əhəmiyyətindən, ölkəmizdə bu istiqamətdə aparılan işlərdən, həmçinin ekoloji maarifləndirmə tədbirlərinin vacibliyindən söz açıb. Prof. Cəfər Cəfərov təqdim olunan kitabın əhatə etdiyi mövzu və istiqamətlərin günün qlobal ekoloji problemlərinin araşdırılması və həlli kontekstində vacibliyini vurğulayıb, tədris prosesində də bu kitabdan dərs vəsaiti kimi istifadə olunmasının zəruriliyini qeyd edib.

Kitabın müəlliflərindən prof. Nizami Məmmədov əsərin əhatə etdiyi məsələlər haqqında geniş məlumat verib, bəşəriyyətin ekoloji təhlükəsiz inkişafa keçid yolunda olduğunu və ergetika sahəsində yaşıl inqilabın reallaşdırılmasının ekoloji sivilizasiyanın formalaşmasında mühüm nəticələr verəcəyini qeyd edib. Digər müəllif prof. Sevda Məmmədəliyeva atası akademik Y.Məmmədəliyevlə bağlı xatirələrini paylaşıb, Azərbaycan neft-kimya elmini dünya miqyasında təmsil edən akademik Y.Məmmədəliyevin yaşıl energetikanın inkişafına verdiyi töhvələr barədə danışıb. S.Məmmədəliyeva diqqətə çatdırıb ki, dövrünü bir əsr qabaqlayaraq, 1933-cü ildə Azərbaycanın neft qazlarından alternativ və ekoloji təmiz yanacaq kimi hidrogenin alınması və prosesin sənaye miqyasında tətbiqi onun bu istiqamətdə novator tədqiqatlarından biridir. ADPU-nun Kimya və biologiya fakültəsinin dekanı dosent Reyhan Ağayeva çıxışında ölkəmizdə keçiriləcək COP29 tədbirlərinin önəmini vurğulayaraq, qlobal ekoloji problemlərin həllində bərpaolunan və yaşıl enerji layihələrinin Azərbaycanın enerji strategiyasında yeni eranın başlanğıcı olduğunu, bu ideyaların illər əvvəl təməlini qoymuş akademik Y.Məmmədəliyevin tədqiqatlarının müasir dövrün tələbləri ilə uzlaşdırılmış şəkildə araşdırılmasının nəticəsi olan kitabın olduqda təqdirəlayiq təşəbbüs olduğunu bildirib. Qeyd edək ki, əsər Azərbaycan, rus və ingilis dillərində təqdim olunub.

## Tələbələr üçün IB təlimləri davam edir

Beynəlxalq əlaqələr üzrə prorektorluğunun nəzdində Təlim-Tədris Mərkəzi və Avropa Azərbaycan Məktəbinin (AAM) əməkdaşlığı çərçivəsində təşkil olunan tələbələr üçün "Avropa Azərbaycan Məktəbi Beynəlxalq Bakalavriat (IB) proqramı" mövzusunda təlimlər davam edir. 6 ay müddətində davam edəcək təlimlər ADPU-nun IV tədris ilinin tələbələri və magistrantlar üçün nəzərdə tutulub. Təlimlər AAM-in direktoru Françesko Bankini tərəfindən əyani formada keçirilir.

Qeyd edək ki, IB təlimlərinin əsas məqsədi IB kurikulumunun əsas tələb və meyarları əsasında peşəkar müəllim profilini inkişaf etdirməkdir. Təlim proqramının digər məqsədi tədris prosesinin təşkili zamanı IB kurrikulumunun tətbiqi, bu zaman istifadə olunan metod və alətlər, öyrətmənin effektivliyini artıran strategiyalar və bu strategiyalar vasitəsilə keyfiyyətli tədris mühitinin yaradılması yollarını gələcək müəllimlərə öyrətməkdir.



Ümumilikdə, 40 nəfərədək tələbənin qoşulduğu təlimləri uğurla tamamlayan iştirakçılara sertifikat təqdim ediləcək.

## "Yaşıl dünya - sağlam gələcək!" – ADPU-nun Şəki filialında sərgi-müsabiqə



ADPU-nun Şəki filialında Karyera Mərkəzinin dəstəyi, Tələbə Gənclər Təşkilatının (TGT) təşkilatçılığı ilə "Yaşıl dünya naminə həmrəylik ili" çərçivəsində "Yaşıl dünya – sağlam gələcək!" adlı sərgi-müsabiqə keçirilib.

Müsabiqə çərçivəsində filial tələbələrinin ekologiya və ətraf mühitin mühafizəsinə həsr etdikləri əl işlərindən (rəsm, toxuma, qurma və s.) ibarət əsərlərin sərgisi təşkil edilib. Həmçinin təqdim olunmuş işlər müvafiq komissiya tərəfindən dəyərləndirilib və münsiflərin rəylərinə əsasən qaliblər müəyyənləşdirilib.

## Qırğızıstan Beynəlxalq Universitetinin nümayəndə heyəti ADPU-da



Noyabrın 15-də Qırğızıstan Beynəlxalq Universitetinin nümayəndələri - rektor akademik Asilbek Aydaraliyev və elm və beynəlxalq əlaqələr üzrə prorektor Maksatbek ADPU-da olublar.

Görüşdə ADPU-nu rektor professor Cəfər Cəfərov, tədris işləri üzrə prorektor dosent Eldar Aslanov, sosial və humanitar məsələlər üzrə prorektor professor Fikrət Rzayev və Beynəlxalq əlaqələr şöbəsinin müdiri Günay Məhərrəmova təmsil ediblər.

Görüş zamanı rektor C.Cəfərov ADPU-nun tarixi, strukturu, təhsil proqramları və beynəlxalq əlaqələri haqqında qonaqlara ətraflı məlumat verib, əməkdaşlıq çərçivəsində mübadilə proqramları, birgə layihələr, eləcə də elmi tədbirlər kimi fəaliyyətlərin hər zaman diqqətdə saxlanıldığını bildirib. Rektor qeyd edib ki, bu kimi beynəlxalq əməkdaşlıqlar universitetin missiyasına uyğun olaraq həm tələbə və müəllimlərin təcrübəsini artırmaq, həm də elmi tədqiqatların səviyyəsini yüksəltmək məqsədi daşıyır. Bu cür əməkdaşlıqların uğurla həyata keçirilməsinin ADPU-nun qlobal standartlara uyğun universitet olma vizyonunun bir hissəsi olduğunu vurğulayan ADPU rektoru, Qırğızıstan Respublikasının ali təhsil müəssisələri ilə əlaqələrin inkişaf etdirilməsinin hər iki ölkənin milli maraqlarına uyğun olması ilə yanaşı, regional inkişafın təmin olunmasına xidmət etdiyini bildirib. Sonda qonaqlar ADPU-da yenilənmiş infrastrukturla tanış olub, tələbələr üçün yaradılmış tədris mühitini müşahidə ediblər. Qonaqlara universitetin xatirə hədiyyələri təqdim edilib.

# ADPU əməkdaşları Zəfər Gününü şəhid tələbə və məzunların ailələri ilə keçiriblər




Universitetin İctiamiyyətlə əlaqələr və marketinq şöbəsinin əməkadaşları Zəfər Günündə ADPU-nun məzunu olan Vətən müharibəsi şəhidlərinin ailələrini ziyarət edib, yeni çapdan çıxmış "Zəfərnamə (ADPU-nun qəhrəmanları)" kitabını şəhid ailələrinə təqdim ediblər.

Şöbənin əməkdaşı Məhəmmməd İsrayılzadə Qəbələ rayonunun Tüntül kəndində şəhid Tapdıq Ağayevin ailəsini ziyarət edib. M.İsrayılzadə Pedaqoji Universitet ailəsi adından şəhidin ailə üzvlərinə Zəfər Günü münasibətilə təbriklərini çatdırıb, bu möhtəşəm zəfərin memarlarından olan şəhidin ruhuna ehtiram ifadə edib. Diqqətə çatdırılıb ki, Tapdığın timsalında bütün şəhid tələbə və məzunların xatirələrinin əbədiləşdirilməsi ADPU rəhbərliyi tərəfindən daim diqqətdə saxlanılır.

Daha sonra içərisində Tapdıq haqqında məlumatların da yer aldığı "Zəfərnamə (ADPU-nun qəhrəmanları") kitabı şəhidin yaxınlarına təqdim edilib. Görüş əsnasında şəhidin atası Çingiz Ağayev və bacısı Tapdıq haqqında xatirələrini bölüşüb, şəhidin adına yaradılmış xatirə muzeyi ilə tanışlıq baş tutub. Sonra şəhidin məzarı ziyarət edilib.

Qeyd edək ki, Ağayev Tapdıq Çingiz oğlu 1990-cı ildə Qəbələ rayonunun Tüntül kəndində anadan olub. Bakı Sənaye-Pedaqoji Texnikumunun (indiki ADPU-nun nəzdində ADPK) Hərbi və bədən tərbiyəsi müəllimliyi ixtisasında təhsil alıb. Bir müddət doğma rayonunda müəllim olaraq fəaliyyət göstərib. Bundan sonra yenidən ordu sıralarına qayıdaraq müddətdən artıq xidmət etməyə başlayıb.

44 günlük Vətən müharibəsinə ilk günlərindən qoşulan Tapdıq oktyabrın 8-də şəhidlik zirvəsinə yüksəlib. 22 gün neytral ərazidə qalan Tapdığın nəşi oktyabrın 30-da doğma kəndində dəfn edilib.

Ölümündən sonra "Cəsur döyüşçü", "Vətən uğrunda" və "Füzulinin azad olunmasına görə" medalları ilə təltif edilib. T.Ağayevin dəfnindən 40 gün keçməmiş anası da dünyasını dəyişib. Şəhid Tapdıq Ağayev ailəli idi, bir övladı yadigar qalıb.

Şöbənin əməkdaşı Elvin Vahidov isə Kürdəmir rayonunun Şilyan (Qarasu) kəndində Vətən müharibəsi şəhidi, ADPU-nun məzunu Qoşqar Ömərovun ailəsini ziyarət edib. E.Vahidov universitet rəhbərliyi adından Zəfər Günü və Dövlət Bayrağı Günü münasibətilə şəhid ailəsini təbrik edib, xalqımızın ərazi bütövlüyü və suverenliyimiz uğrunda canından keçmiş şəhidlərin xatirəsini ədəbi yaşadacağını bildirib.

Görüş zamanı şəhidin ev muzeyi və məzarı ziyarət olunub, şəhidin atası Səxavət Ömərov və yaxınları Qoşqarın həyat hekayəsi və döyüş yolu barədə xatirələrini bölüşüblər. Görüş çərçivəsində Qoşqar haqqında məlumatların da əks olunduğu "Zəfərnamə (ADPU-nun qəhrəmanları") kitabı ailəyə təqdim edilib.

Qeyd edək ki, Ömərov Qoşqar Səxavət oğlu 1994-cü ildə Kürdəmir rayonunun Şilyan (Qarasu) kəndində anadan olub. 2011-2015-ci illərdə ADPU-nun Riyaziyyat və informatika müəllimliyi ixtisasında təhsil alıb. 2018-ci ildən pedaqoji fəaliyyətlə məşğul olan Qoşqar 2020-ci ilə Vətən müharibəsinin ilk günlərindən Füzuli istiqamətində döyüşlərə qoşulub. Noyabrın 4-də Şuşanın Daşaltı kəndi ərafında gedən döyüşlərdə qəhrəmanlıqla şəhid olan Q.Ömərov ölümündən sonra "Vətən uğrunda", "Füzulinin azad olunmasına görə ", "Xocavəndin azad olunmasına görə" və "Şuşanın azad olunmasına görə" medalları ilə təltif edilib.

Həmçinin ADPU-nun Şamaxı filialının direktoru dosent Tünzalə Yusifova filialın professor-müəllim heyəti ilə birgə filialın Vətən müharibəsində şəhid olmuş məzunları leytenant Orxan Nəbiyev və baş leytenant Elgün Əzizovun məzarlarını ziyarət edib, yaxınları ilə görüşüb. Görüş çərçivəsində dos. T.Yusifova "Zəfərnamə (ADPU-nun qəhrəmanları)" kitabını şəhid ailələrinə təqdim edib.

Qeyd edək ki, Şamaxı filialının Azərbaycan dili və ədəbiyyatı müəllimliyi ixtisasının 2011-ci il məzunu, Vətən müharibəsi şəhidi baş leytenant Əzizov Elgün Elman oğlu ölümündən sonra "Vətən uğrunda", "İgidliyə görə", "Füzulinin azad olunmasına görə" və "Xocavəndin azad olunmasına görə" medalları ilə təltif edilib. Eyni ixtisasın 2016-cı il məzunu olan şəhid leytenant Nəbiyev Orxan Rza oğlu ölümündən sonra "Döyüşdə fərqlənməyə görə", "Suqovuşanın azad olunmasına görə", " Vətən uğrunda" medalları və "Azərbaycan bayrağı" ordeni ilə təltif olunub. ADPU-nun Şəki filialının direktoru dosent Vurğun Məmmədov və filailın əməkdaşları isə Oğuz rayonunun Xaçmaz kəndində 44 günlük Vətən müharibəsində qəhrəmanlıqla şəhid olan Rəvan Lətifovun ailəsini ziyarət ediblər. Şəhidin anası Gültəkin Lətifova Rəvanın keçdiyi döyüş yolundan və təltiflərindən danışıb, Rəvana və Vətən müharibəsində həlak olmuş şəhidlərə həsr etdiyi şeir və hekayələri ilə qonaqları tanış edib. Şəhidin ailəsinə ehtiram və minnətdarlığını ifadə edən dos.V.Məmmədov "Zəfərnamə (ADPU-nun qəhrəmanları)" kitabını Rəvanın ailəsinə təqdim edib.

Lətifov Rəvan Ömür oğlu Pedaqoji Universitetin "Təhsilin təşkili və idarə olunması" ixtisasının 2012-ci il məzunudur, müharibədən əvvəl müəllim kimi fəaliyyət göstərib. Şəhid müəllim ölümündən sonra "Vətən uğrunda", "Cəsur döyüşçü" və "Şuşanın azad olunmasına görə" medalları ilə təltif edilib.

ADPU-nun Vətən müharibəsi və sonrakı dövrdə ümumilikdə 18 nəfər tələbə və məzunu şəhidlik zirvəsinə yüksəlib, yüzlərlə tələbə və məzun isə döyüşlərdə qəhrəmancasına savaşıb. Hazırda universitetdə 14 nəfər Vətən müharibəsi iştirakçısı təhsil alır.

# Pedaqoji Kollecin inklüziv təhsillə bağlı layihəsi bp-dən qrant qazanıb




ADPU-nun nəzdində Azərbaycan Dövlət Pedaqoji Kollecinin Elm və Ali Təhsil üzrə Dövlət Agentliyinin dəstəyi ilə bp şirkətinə təhsilin inkişafına dəstək istiqaməti üzrə təqdim etdiyi "İnklüziv təhsil üzrə ixtisaslaşan tələbələrin bilik və bacarıqlarının inkişafı" layihəsi təxminən 50000 AZN miqdarında qrant qazanıb. Layihənin əsas məqsədi inklüziv təhsil üzrə tədris infrastrukturunun və tədrisin keyfiyyətinin artırılması, "İnklüziv təhsil", "Sosial iş" və "Ailə və ev təhsili" üzrə ixtisaslaşan tələbələrin bilik və bacarıqlarını inkişaf etdirməyə yardım edən tədris və təlim laboratoriyalarının yaradılmasıdır. Qeyd edək ki, layihə çərçivəsində Azərbaycan Dövlət Pedaqoji Kollecində üç laboratoriya (diaqnostika və korreksiya üzrə psixo-pedaqoji təlim-tədris laboratoriyası, diaqnostika və korreksiya üzrə loqopedik təlim-tədris laboratoriyası və müalicəvi idman üzrə təlim-tədris laboratoriyası) 54 adda 100-dən çox avadanlıq və cihazla təmin olunacaq və kollecin pedaqoji və inzibati heyəti üçün həmin laboratoriyaların düzgün idarə edilməsi üzrə təlimlər keçiriləcək.

# Narkomaniya ilə mübarizəyə aid görüş



Noyabrın 22-də ADPU TGT-nin təşkilatçılığı ilə narkomaniyaya qarşı mübarizəyə dair "Sağlam Gənclik, Parlaq Gələcək" mövzusunda onlayn maarifləndirici görüş keçirilib.Açılış nitqi ilə çıxış edən ADPU-nun sosial və humanitar məsələlər üzrə prorektoru professor Fikrət Rzayev gənclər arasında müasir dövrün aktual problemlərindən biri olan narkomaniyaya qarşı mübarizə və bu istiqamətdə maarifləndirmə işlərinin geniş kütləyə çatdırılmasının əhəmiyyətini qeyd edərək, gələcək nəsillərin sağlam yetişmələri üçün bu kimi görüşlərin vacibliyini vurğulayıb. Görüşdə çıxış edən ADPU-nun 4 nömrəli Tələbə poliklinikasının baş həkimi Şəfəq Teymurova və həkimi Turan Hüseynova bəşəriyyətin ciddi bəlası olan narkomaniyaya aludəçilik hallarının yaranması və faciəvi fəsadlarını tələbələrin diqqətinə çatdırıblar. Bakı Narkoloji Mərkəzi və "İşgəncələr Əleyhinə Araşdırmalar Mərkəzi" İnsan Hüquqları Təşkilatının psixoterapevti Günay Babayeva tələbələrə narkomaniyaya yol açan sosial və psixoloji amillər haqqında ətraflı məlumat verib, insanların sağlamlığına, həyatına və mənəvi-əxlaqi dəyərlərə mənfi təsir edən bu problemlə mübarizənin effektiv üsulları barədə geniş təqdimatla çıxış edib.

# "Məktəbəqədər təhsildə liderlik" proqramı üzrə təlimlər başlayıb




ADPU-nun Strateji İnkişaf Mərkəzi (ADPU SİM) və Məktəbəqədər və Ümumi Təhsil üzrə Dövlət Agentliyinin (MÜTDA) birgə təşəbbüsü ilə həyata keçirilən "Məktəbəqədər təhsildə liderlik" proqramı üzrə təlimlərə start verilib. İlkin olaraq "Məktəbəqədər təhsil müəssisələrinin (MTM) heyətinin idarə edilməsi" və "Təlim-tərbiyə prosesinin təşkili və idarə edilməsi" modulları üzrə təlimlər təşkil olunub. Proqram çərçivəsində növbəti həftədən etibarən "MTM-də daxili keyfiyyət sisteminin qurulması", "MTM-də sənədlərlə iş " modullarının tədrisi nəzərdə tutulub.

Qeyd edək ki, proqrama 600-dən çox namizəd müraciət edib. 200-dən çox namizəd müsahibə mərhələsində iştirak hüququ qazanıb ki, bu namizədlərdən də 107 nəfəri müsahibədən uğurla keçərək proqramda iştirak şansı əldə edib. Proqram üzrə təlimlər Bakı və Sumqayıt şəhərləri, Abşeron rayonundan olan iştirakçılardan ibarət 2 qrupda, digər regionlardan olan iştirakçılar üçün isə 1 qrupda, əsasən onlayn olmaqla hibrid formada təşkil olunub.

# Beynəlxalq Könüllülər Günü qeyd olunub



Dekabrın 5-də ADPU TKTB-nin təşkilatçılğı ilə 5 Dekabr – Beynəlxalq Könüllülər Gününə həsr edilmiş " KönüllüSƏN, ən öndəSƏN" adlı bədii tədbir keçirilib.

Tədbiri giriş sözü ilə açan ADPU-nun sosial və humanitar məsələlər üzrə prorektoru professor Fikrət Rzayev qeyd edib ki, Birləmiş Millətlər Təşkilatının təşəbbüsü ilə 1985-ci ildən etibarən 5 dekabr tarixi bütün dünyada Beynəlxalq Könüllülər Günü kimi qeyd edilir.

Prof. F.Rzayev bildirib ki, bütün dünyada olduğu kimi, ölkəmizdə də könüllülər cəmiyyətin hərəkətverici qüvvəsi, ictimai məsuliyyətin təcəssümüdür. Onların müxtəlif layihələrdə göstərdikləri əzmkarlıq və fədakarlıq həm şəxsi inkişaflarına, həm milli maraqların qorunması və təbliğinə, həm də cəmiyyətin tərəqqisinə mühüm töhfələr verir. Pedaqoji Universitetin daxilində fəaliyyət göstərən ictimai təşkilatların hər zaman öz fəallıqları ilə fərqləndiklərini qeyd edən prorektor əlamətdar gün münasibətilə bütün könüllüləri səmimi-qəlbdən təbrik edib və ictimai fəaliyyətdə yeni uğurlar arzu edib. Sonra universitetin ictimai-sosial həyatında fəallıqları ilə seçilən tələbələr Fəxri fərmanla təltif ediliblər.

Çıxış edən ADPU TKTB-nin sədri Səidə Abulova qonaqları salamlayıb, Beynəlxalq Könüllülər Günü münasibətilə tələbələri təbrik edərək, gəncləri onlar üçün hazırlanmış tədbirdən zövq almağa çağırıb. Böyük maraqla qarşılanan tədbirin bədii hissəsində tələbələr tərəfindən hazırlanmış musiqi nümunələri, milli filmlərdən seçilmiş səhnəciklər təqdim edilib, milli və xarici rəqslərdən ibarət fləşmob nümayiş etdirilib, əyləncəli oyun və viktorinalar keçirilib.

## ADPU rektoru Azərbaycanlı Elm Adamları Dərnəyinin İstanbul görüşündə iştirak edib




Azərbaycan Respublikasının Diasporla İş üzrə Dövlət Komitəsi, Türkiyə-Azərbaycan Dərnəkləri Federasiyası (TADEF) və ABİD-in birgə təşkilatçılığı ilə İstanbul şəhərində Türkiyədə fəaliyyət göstərən Azərbaycanlı Elm Adamları Dərnəyinin (ABİD) ilk iclası keçirilib. İclasda Diasporla İş üzrə Dövlət Komitəsinin sədrinin birinci müavini Valeh Hacıyev, Azərbaycanlı Elm Adamları Dərnəyinin sədri, Türkiyənin Bilkent Universitetinin professoru Əmirulla Məmmədov, Türkiyə parlamentinin müşahidə missiyasının rəhbəri, Türkiyə Böyük Millət Məclisinin Türkiyə-Azərbaycan parlamentlərarası dostluq qrupunun rəhbəri Şamil Ayrım, Azərbaycanın Türkiyədəki Səfirliyinin təhsil məsələləri üzrə müşaviri Nəcibə Nəsibova, Türkiyə-Azərbaycan Dərnəkləri Federasiyasının rəhbəri Ədalət Turan, Elm və Təhsil Nazirliyi yanında Elm və Ali Təhsil üzrə Dövlət Agentliyinin Beynəlxalq əməkdaşlıq şöbəsinin müdiri Müjdət Həsənov, Pedaqoji Universitetin rektoru Cəfər Cəfərov, Bakı Dövlət Universitetinin rektoru Elçin Babayev, Azərbaycan Texniki Universitetinin rektoru Vilayət Vəliyev, Azərbaycan Memarlıq və İnşaat Universitetinin rektoru Gülçöhrə Məmmədova, Qarabağ Universitetinin Elm şöbəsinin müdiri Elçin İbrahimov, Azərbaycan Dövlət İqtisad Universitetinin prorektoru Rövnəq Rzayev, eləcə də qardaş ölkədə fəaliyyət göstərən nüfuzlu alim və ziyalılar, ictimaiyyət nümayəndələri iştirak ediblər. İclasda çıxış edən Azərbaycan Dövlət Pedaqoji Universitetinin rektoru professor Cəfər Cəfərov diqqətə çatdırıb ki, ölkəmiz üçün həm qardaş, həm də strateji tərəfdaş olan Türkiyə həmyerlilərimizin bütün sahələrdə olduğu kimi, elmi inkişaf və tədqiqat sahəsində də ən geniş fəaliyyət göstərdikləri ölkədir. Türkiyə dövləti tərəfindən həmyerlilərimizin ölkənin elm sahəsində fəaliyyətlərinə hərtərəfli dəstək göstərilməklə yanaşı, onların elmi nailiyyətləri daim yüksək qiymətləndirilib. C.Cəfərov bildirib ki, Azərbaycanlı Elm Adamları Dərnəyinin fəaliyyəti sayəsində iki qardaş ölkənin əməkdaşlıq bağları daha da möhkəmlənəcək, bu sahədə təcrübə mübadiləsi genişlənəcək və mühüm elmi yenilik və nailiyyətlər ərsəyə gələcək. ABİD-ə gələcək fəaliyyətində uğurlar arzu edən rektor təşkilatın fəaliyyəti ilə həm Azərbaycanın, həm də Türkiyənin gələcək inkişafına böyük töhfələr verəcəyinə əmin olduğunu bildirib. İki gün davam edən iclasda ABİD-in növbəti toplantılarından birinin Bakıda təşkili, Azərbaycanın ali təhsil müəssisələri ilə əməkdaşlıq imkanları, universitetlərin inkişafı istiqamətində birgə fəaliyyət və ortaq fəaliyyətlərin təşkili məsələləri müzakirə edilib.

## ADPU rektoru magistrantlarla görüşüb



ADPU-da Təhsilin təşkili və idarə edilməsi (MBA) ixtisaslaşmasında təhsil alan magistrantların Təhsildə strateji idarəetmə fənni üzrə növbəti dərslərində Pedaqoji Universitetin rektoru professor Cəfər Cəfərov qonaqları olub. "ADPU-daa strateji idarəetmənin xüsusiyyətləri: Müəssisənin xarici və daxili mühitinin təhlili" mövzusunda keçirilən görüşdə giriş sözü ilə çıxış edən ADPU-nun elm və innovasiyalar üzrə prorektoru professor Asəf Zamanov görüşün magistrantların idarəçilik və liderlik bacarıqlarının inkişafı baxımından əhəmiyyətini xüsusi vurğulayıb. A.Zamanov rektorun praktik təcrübəsinin və peşəkar idarəçilik bacarıqlarının magistrantlar üçün səmərəli öyrənmə mühiti yaradacağını və görüşdə iştirak edən magistrantların bu fikir mübadiləsindən zəngin təcrübə əldə edəcəklərini qeyd edərək, gənclərin görüş nəticəsində əldə edəcəkləri təcrübənin onların peşəkar karyeralarının inkişafında vacib fayda verəcəyinə əmin olduğunu bildirib. ADPU-nun rektoru professor Cəfər Cəfərov təhsil müəssisələrinin idarə edilməsi sahəsində beynəlxalq təcrübələr, strateji idarəçilik modelləri və effektiv rəhbərlik yanaşmalarından bəhs edib, ADPU-da qabaqcıl təcrübələrdən istifadə edərək müasir standartlara cavab verən peşəkar kadrlar hazırlanması sahəsində aparılan islahatlar barədə magistrantlara məlumat verib. Universitetdə strateji inkişaf planının hazırlanması və tətbiqi mexanizmləri barədə danışan prof. C.Cəfərov daxili və xarici mühitin analizi və bu proseslərin təhsilin keyfiyyətinə təsiri barədə ətraflı məlumat verib. Magistrantlar tərəfindən böyük maraqla qarşılanan görüş onları maraqlandıran məsələlər ətrafında fikir mübadiləsi ilə davam edib.

## Özbəkistanlı tələbələr Pedaqoji Universitetdə mübadilədə iştirak edirlər



Özbəkistan Respublikasının Nizami adına Daşkənd Dövlət Pedaqoji Universitetinin (DDPU) Tarix fakültəsinin Mənəviyyatın əsasları və hüquqi təhsil ixtisasının III-IV tədris ili tələbələri qarşılıqlı əməkdaşlıq çərçivəsində ADPU-da tələbə mübadiləsində iştirak ediblər. Noyabrın 28-də tələbələr ADPU-nun beynəlxalq əlaqələr üzrə prorektoru, filologiya elmləri doktoru, professor Mahirə Hüseynova ilə görüşüblər. Görüşdə tələbələrə ADPU-nun beynəlxalq fəaliyyətləri haqqında ətraflı məlumat verilib. Professor M.Hüseynova, eyni zamanda, tələbələrə akademik mübadilə çərçivəsində fəaliyyətlərində uğur qazanmaq üçün müvafiq dəstək göstəriləcəyini vurğulayaraq, hər hansı çətinliklə qarşılaşacaqları halda operativ şəkildə hər cür dəstəyin göstəriləcəyini qeyd edib.

Özbək tələbələrin mübadiləsi 26 noyabr – 29 dekabr tarixləri arasında davam edir. Bu müddət ərzində tələbələr ADPU-nun Tarix və coğrafiya fakültəsinin Tarix müəllimliyi ixtisasının mühazirələrində iştirak edəcək, tələbə və müəllim heyəti ilə müzakirələr apararaq yeni təcrübələrə yiyələnəcəklər.

Qeyd edək ki, Pedaqoji Universitetlə DDPU arasında hər iki ölkənin dili, tarixi, mədəniyyəti, təhsil sistemi ilə tanışlıq və universitetlərin elmi və tədris sahəsində əməkdaşlıq əlaqələrinin genişləndirilməsi məqsədilə 2022-ci ildə imzalanmış əməkdaşlıq müqaviləsi çərçivəsində mütəmadi olaraq tələbə və müəllim mübadilələri həyata keçirilir. Ötən tədris ilinin payız və yaz semestrlərində DDPU-nun Musiqi müəllimliyi və İngilis dili və ədəbiyyatı ixtisaslarının tələbələri də ADPU-da mübadilə iştirak ediblər.

## ADPU-da Respublika elmi konfransı: "Fizikanın aktual problemləri"



ADPU-da "Fizikanın aktual problemləri" Respublika elmi konfransı keçirilib. Konfransı giriş sözü ilə açan ADPU-nun elm və innovasiyalar üzrə prorektoru professor Asəf Zamanov konfransın elmi-praktik əhəmiyyətindən və fizika elminin inkişaf istiqamətlərinin genişləndirilməsi baxımından vacibliyindən danışıb. Azərbaycanda fizika elminin inkişaf tarixi və azərbaycanlı alimlərin bu sahə üzrə dünya elminə verdiyi töhfələrdən danışan prof. A.Zamanov müasir dövrdə bu elmin inkişafı üçün atılan addımlar və mövcud problemlərin həlli istiqamətində həyata keçirilməli olan vacib tədbirləri diqqətə çatdırıb. Prorektor vurğulayıb ki, müasir dövrün tələblərinə cavab verən elmi texnologiyaların, cihaz və avadanlıqların ölkəmizə gətirilməsi və geniş praktik tətbiqinin həyata keçirilməsi qarşıda duran vacib məsələdir. Bəzi hallarda isə istifadə üçün müasir, yeni nəsil cihaz və avadanlıqlar gətirilsə də, bu texnologiyalardan istifadə edə bilən mütəxəssislər kifayət qədər deyil. Bu problemin aradan qaldırılması üçün yerli gənc mütəxəssislərin inkişaf etmiş və elmin inkişaf səviyyəsi ilə fərqlənən ölkələrin aparıcı elmi mərkəzlərində təcrübə keçmək üçün ezam edilmələri, daha sonra əldə etdikləri bilik və bacarıqları ölkəmizdə tətbiq etmələri xüsusi diqqətdə saxlanılmalıdır.

A.Zamanov qeyd edib ki, hazırda elmlərarası tədqiqatların coğrafiyasının genişləndirilməsi də fizika sahəsində olduqca ciddi uğurların əldə edilməsinə səbəb ola bilər. Çıxış edən ADPU-nun Fizika fakültəsinin dekanı dosent Arzu Daşdəmirov bildirib ki, konfransa 130-dan çox məruzə təqdim edilib. Pedaqoji Universitetlə yanaşı Bakı Dövlət Universiteti, Bakı Mühəndislik Universiteti, Azərbaycan Dövlət Neft və Sənaye Universiteti, Azərbaycan Texniki Universiteti və Gəncə Dövlət Universitetinin də əməkdaşları konfransa məqalə təqdim ediblər.

Plenar iclasda professor Namiq Niftiyev "MnGa2S4 monokristalının elektrik keçiriciliyi", Orxan Güləhmədov "Enhancing triboelectric nanogenerator performance using NYLON/MWCNT nanocomposites fabricated via spray coating method", Səidə Zalova "Meylli maqnit sahəsində yarımkeçirici ifratqəfəsdə elektromaqnit şüalanmasının altzonalararası udulması", dosent Oqtay Həsənov "Описание электронного учебного модуля «Физика атомного ядра»" mövzularında məruzə ilə çıxış ediblər. Sonra konfrans fəaliyyətini bölmə iclaslarında davam etdirib.

## ADPU-nun müəllimləri Bartın Universitetində mobillikdə




ADPU-nun Filologiya fakültəsinin müəllimi Qəmər Alxanova, Məktəbəqədər təhsil faükltəsinin müəllimi Günay Bədəlzadə, İbtidai təhsil fakültəsinin müəllimi Günel Məmmədova və İncəsənət və fiziki tərbiyə fakültəsinin müəllimi Gülnaz Atakişizadə Erasmus+ mübadilə proqramı çərçivəsində 25-29 noyabr tarixlərində Türkiyənin Bartın Universitetində tədris prosesində iştirak ediblər. 5 gün davam edən mobillikdə müəllimlər öz ixtisasları üzrə 8 saat dərs tədris edib, universitet və fakültə ilə tanış olublar.

Qeyd edək ki, mobillik Türkiyənin Bartın Universiteti ilə Azərbaycan Dövlət Pedaqoji Universiteti arasında Erasmus+ proqramı çərçivəsində (Fəaliyyət 1) akademik əməkdaşlıq, tələbə-müəllim mobilliyi həyata keçirmək və təcrübə mübadiləsi məqsədilə 2022-ci ildə imzalanmış müəssisələrarası müqavilə əsasında təşkil edilib.

## "Microsoft Sertifikatlı Təlimçi" təlimləri



ADPU-nun Beynəlxalq əlaqələr üzrə prorektorluğunun nəzdində fəaliyyət göstərən Təlim-Tədris Mərkəzi tərəfindən universitetin professor-müəllim heyəti və əməkdaşları üçün "Microsoft Sertifikatlı Təlimçi" (Microsoft Certified Educator - MCE) imtahanına hazırlıq təlimləri təşkil edilib. Təlimlər p.ü.f.d. Vüsalə Əliyeva, baş müəllim Rumiyyə Camalova, p.ü.f.d. Xalidə Həmidova və baş mütəxəssis Elnarə Allahverdiyeva tərəfindən keçirilib.

Qeyd edək ki, "Microsoft Sertifikatlı Təlimçi" imtahanında uğurlu nəticə əldə edən iştirakçılara beynəlxalq sertifikat təqdim olunacaq.

# Magistrantların Milli Məclisin deputatı Mehriban Vəliyeva ilə görüşü





ADPU-da Milli Məclisin Elm və təhsil komitəsinin üzvü, filologiya üzrə fəlsəfə doktoru Mehriban Vəliyeva ilə görüş və açıq dərs keçirilib. "Müasir təhsil və elmi idarəetmə məsələləri" mövzusunda təşkil edilən görüşdə ADPU-nun Təhsilin təşkili və idarə edilməsi (MBA) və Təhsil üzrə marketinqin təşkili və idarə olunması (MBA) ixtisaslaşması üzrə təhsil alan magistrantları iştirak ediblər.

Görüşü giriş sözü ilə açan ADPU-nun elm və innovasiyalar üzrə prorektoru professor Asəf Zamanov görüşün mahiyyəti və vacibliyi barədə danışıb. A.Zamanov Pedaqoji Universitetdə təhsil alan magistrantların nəzəri biliklərə yiyələnmələri ilə yanaşı, idarəetmə, elm və təhsil sahəsində də geniş təcrübəyə malik şəxslərin praktik təcrübələrindən faydalanmalarının təmin edilməsi üçün mütəmadi olaraq bu cür görüşlərin təşkil edildiyini qeyd edib.

Mehriban Vəliyevanın Azərbaycanın elm və təhsil sahəsində özünəməxsus yeri olduğunu vurğulayan prorektor onun gənclərlə bölüşəcəyi zəngin praktik təcrübələrin magistrantların peşəkar inkişafı üçün çox faydalı olacağını qeyd edib.

Milli Məclisin deputatı Mehriban Vəliyeva müasir təhsilin elmi idarə edilməsi yolları, idarəetmədə tərəflər arasında məsuliyyətin bölüşdürülməsi, zamanın idarə edilməsi, düzgün məqsəd, normativ sənədlər və fəaliyyətin uzlaşdırılması, maddi-texniki bazanın, insan resurslarının və nəticənin idarə edilməsi, monitorinq sisteminin qurulması və idarə edilməsi, risklərin idarə edilməsi və kommunikasiya bacarıqları mövzuları ətrafında fikirlərini bölüşüb, magistrantlarla təhsilin və təhsil müəssisələrinin idarə edilməsi sahəsində vacib olan amillər haqqında müzakirələr aparıb.

Müzakirələrdə ADPU-nun Təhsil menecmenti kafedrasının əməkdaşları – dos. Cəsarət Valehov və p.ü.f.d Ramiz Əliyev də yaxından iştirak ediblər.

# IQAinAR layihəsi çərçivəsində təlim səfəri uğurla yekunlaşıb



2-6 dekabr tarixlərində ADPU-da Niderlandın Vittenborq Tətbiqi Elmlər Universitetinin (WUAS) koordinatoru olduğu və Avropa Komissiyası tərəfindən maliyyələşdirilən "Azərbaycan və Rusiya ali təhsil müəssisələrində tədris, təlim və qiymətləndirmə prosesinin daxili keyfiyyət təminatının təkmilləşdirilməsi" (IQAinAR) adlı Erasmus + layihəsi çərçivəsində yekun görüşlər keçirilib.

Layihənin yekun tədbirlərində layihə konsorsiumunun üzvü olan 8 ali təhsil müəssisəsi, həmçinin ali təhsil sahəsində fəaliyyət göstərən Niderlandın "415 International BV" təşkilatının nümayəndələri iştirak ediblər. Tədbir iştirakçıları arasında Niderlandın Vittenborq Tətbiqi Elmlər Universiteti (WUAS), İspaniyanın Müqəddəs Entoni Katolik Universiteti (UCAM), Naxçıvan Dövlət Universiteti (NDU) və Azərbaycan Texniki Universitetinin (AZTU) nümayəndələri də yer alıblar.

Tədbirin ilk günündə iştirakçıları salamlayan ADPU-nun Beynəlxalq əlaqələr şöbəsinin müdiri Günay Məhərrəmova layihənin əhəmiyyəti barədə danışıb. Daha sonra WUAS-ın tədqiqatçısı dr. Rauf Abdul tərəfindən "Keyfiyyət təminatının əsasları və keyfiyyət mədəniyyəti" mövzusunda təlim keçirilib və iştirakçılar arasında qrup işləri təşkil olunub.

Görüşün ikinci günündə layihənin yekun konfransı baş tutub. Daha sonra nümayəndələr təqdimatlarla çıxış ediblər.

Görüşün üçüncü günündə isə WUAS-ın tədqiqatçısı Amal Abi Orm layihənin yekun mərhələsi, maliyyə məsələlərinin idarə olunması və lazımi sənədlərin vaxtında təqdim edilməsinin vacibliyi barədə məlumat verib.

Səfərin yekun günündə Vittenborq Universiteti ilə yerli tərəfdaşlar – ADPU, NDU və AZTU arasında tələbə-müəllim mübadiləsi barədə müzakirələr aparılıb və bu istiqamətdə əməkdaşlığın genişləndirilməsi ilə bağlı razılığa gəlinib.

Qeyd edək ki, bu görüşlər layihənin uğurlu yekunlaşmasına töhfə verməklə yanaşı, ali təhsildə keyfiyyət təminatının inkişafı sahəsində təcrübə mübadiləsi üçün də mühüm platforma yaradıb. 1 həftəlik görüşün yekununda iştirakçılara sertifikatlar təqdim olunub.

## Pedaqoji Universitet Hacettepe və Hacı Bayram Veli universitetləri ilə əməkdaşlığı genişləndirir



Dekabrın 5-də Türkiyənin Hacettepe Universitetinin Təhsil fakültəsinin dekanı professor Şəfiqə Şule Ərçətin və Hacı Bayram Veli Universitetinin dosenti Şuay Nilhan Açıqalın ADPU-da olublar.

Qonaqlarla görüşdə ADPU-nun rektoru professor Cəfər Cəfərov, tədris işlər üzrə prorektoru dosent Eldar Aslanov, elm və innovasiyalar üzrə prorektoru professor Asəf Zamanov və Beynəlxalq əlaqələr şöbəsinin müdiri Günay Məhərrəmova, həmçinin Elm və Ali Təhsil üzrə Dövlət Agentliyinin (EATDA) nümayəndəsi Elza Səmədova iştirak ediblər. Birgə əməkdaşlıq çərçivəsində magistratura səviyyəsində ikili diplom proqramlarının həyata keçirilməsi, tələbə-müəllim mübadiləsinə start verilməsi məsələlərinin müzakirəsi məqsədilə keçirilən görüşdə konkret ixtisaslar üzrə nəzərdə tutulmuş ikili diplom proqramının icrası üçün ilkin danışıqlar aparılıb və tərəflər arasında razılıq əldə olunub.

Sonda qonaqlar ADPU-nun tədris binası ilə tanış olub, onlara xatirə hədiyyələri təqdim olunub.

# Yeni tələbə klubu fəaliyyətə başlayıb



Dekabrın 6-da universitetdə Azərbaycan Respublikası Gənclər və İdman Nazirliyinin (ARGİN) dəstəyi, Azərbaycan Tələbə Gənclər Təşkilatları İttifaqının (ATGTİ) təşəbbüsü ilə yaradılan və ADPU-nun Tələbə Gənclər Təşkilatının (TGT) nəzdində fəaliyyət göstərən VeloLİFE klubunun təqdimatı ilə bağlı infosessiya keçirilib.

İnfosessiyada ATGTİ və ADPU TGT-nin idarə heyətkarinin üzvləri və universitetin fəal tələbələri iştirak ediblər. Görüşdə çıxış edən ATGTİ-nin üzvlərlə iş üzrə meneceri Aqil Quliyev VeloLİFE klubunun yaradılmasının məqsədi, klub tərəfindən həyata keçirilən və gələcək üçün planlaşdırılan layihələr haqqında tələbələrə məlumat verib.

Daha sonra görüş sağlam həyat tərzinin təbliğini və gənclərin bu sahədə maarifləndirilməsini hədəfləyən klubla bağlı tələbələri maraqlandıran suallar ətrafında müzakirə ilə davam edib.

# "Zəfər Turniri" yekunlaşıb



Dekabrın 7-də ADPU THİK-nın təşkilatçılığı ilə "Nə? Harada? Nə zaman?" intellektual oyunu üzrə Zəfər Gününə həsr olunmuş "Zəfər Turniri"nin final mərhələsi keçirilib. Turnir 44 günlük Vətən müharibəsi şəhidlərinin xatirəsinə ithaf olunub.

36 komandada 210 nəfərdən çox tələbənin iştirakı ilə başlanan turnirin final mərhələsində 8 komanda 4 mərhələdə qalibiyyət üçün mübarizə aparıblar.

Gərgin mübarizə şəraitində keçən final mərhələsinin yekun nəticələrinə əsasən ilk 3 yerin qalibi olan komandalar diplom, medal və kubokla yanaşı, pul mükafatı ilə mükafatlandırılıblar. Digər komandalara isə yarışda iştirak etdikləri üçün diplom və sertifikatlar təqdim edilib. Turnirin mükafatlandırma mərasimində iştirak edən ADPU-nun sosial və humanitar məsələlər üzrə prorektoru professor Fikrət Rzayev qalibləri təbrik edib, gənclərin bu cür faydalı layihələrdə böyük maraq və fəallıqla iştirak etmələrinin çox sevindirici hal olduğunu qeyd edib. Gənclərin həm intellektual inkişaflarının dəstəklənməsi, həm də vətənpərvərlik ruhunun aşılanması baxımından belə layihələrin əhəmiyyətli olduğunu vurğulayan prorektor Pedaqoji Universitet tərəfindən tələbələrin bu kimi təşəbbüslərinin daim dəstəkləndiyini diqqətə çatdırıb. Çıxış edən ADPU THİK sədri Camilə Qurbanova qalibləri təbrik edib və layihənin həyata keçirilməsində təşkilati dəstəyə görə Xəzər İntellektual Gənclər Birliyinin rəhbəri Azad Manaflıya təşəkkürünü çatdırıb.

## ADPU-da tələbələrin fərdi inkişafına dəstək verən layihələr davam edir





Dekabrın 7-də ADPU-da tələbələrin intellektual və yaradıcı potensiallarının dəstəklənməsi, şəxsi inkişaf və dil biliklərinin təkmillşdirilməsinə yönəlmiş silsilə layihələrin növbəti mərhələsi baş tutub.

ADPU TKTB nəzdində fəaliyyət göstərən Dil və Musiqi dərnəklərinin növbəti dərsləri təşkil edilib. Dərnəklər çərçivəsində Məktəbəqədər təhsil fakültəsinin tələbəsi Aydan Süleymanlı tərəfindən piano, İncəsənət və fiziki tərbiyə fakültəsinin tələbəsi Mənzər Verdiyeva tərəfindən rəqs, fakültənin digər tələbəsi Arzu Orucəliyeva tərəfindən rus dili, Kimya və biologiya fakültəsinin tələbəsi Ləman İsmayılova tərəfindən isə alman dili dərslərinin növbəri məşğələləri tədris edilib.

ADPU YENİ Klubun təşkilatçılığı ilə tələbələrə danışma və eşitmə qabiliyyəti məhdud olan şəxslərlə danışmaq üçün işarə dilini öyrənməklə bağlı seminar keçirilib. Seminarda tələbələrə işarə dilində hərflər, sözlər və söz birləşmələri öyrədilib.

ADPU THİK də həftəyə maraqlı layihələrlə yekun vurub. Təşkilatın nəzdində fəaliyyət göstərən Musiqi klubu tərəfindən təşkil edilən gitara və skripka dərsləri, eləcə də "Kaspi" klubu tərəfindən keçirilən rus dili və ingilis dili dərsləri tələbələr tərəfindən böyük maraqla qarşılanıb.

TGT İdarə Heyəti isə təşkilatın aylıq fəaliyyətini dəyərləndiriblər. ADPU TGT-nin aylıq hesabat iclası çərçivəsində təşkilatın son ay ərzində həyata keçirdiyi tədbir və layihələrin hesabatı dinlənilib, növbəti ay üçün fəaliyyət istiqamətləri müzakirə edilib. TGT-nin sədri Çiçək Sultanlı gələcək fəaliyyət strategiyası və strukturun səmərəliliyinin artırılması ilə bağlı məruzə ilə çıxış edib, struktur rəhbərlərinin rəy və təklifləri dinlənilib.

Gün ərzində icra edilən bütün layihələrdə iştirak edən ADPU-nun sosial və humanitar məsələlər üzrə prorektoru professor Fikrət Rzayev, eləcə də Tədbirlərin təşkili və tələbələrlə iş şöbəsinin mütəxəssisi İsmayıl Nəsirov və ADPU-nun Heydər Əliyev Mərkəzinin mütəxəssisi Tərlan Ağayev də gənclərə dəstəklərini ifadə edərək, tələbələrin asudə vaxtlarının səmərəli təşkili, onların hərtərəfli inkişafının təmini istiqamətində həyata keçirilən layihələrin əhəmiyyətini diqqətə çatdırıblar.

## Nümunəvi dərslər təqdim edilib

Dekabrın 9-da "Müasir təlim texnologiyalarına və beynəlxalq təcrübəyə əsaslanan yeni məzmunlu təhsilin ADPU-da tətbiqi" layihəsi üzrə hazırlanmış nümunəvi dərslərin təqdimatı keçirilib. Təqdimatda ADPU-nun rektoru professor Cəfər Cəfərov, tədris işlər üzrə prorektor dosent Eldar Aslanov, elm və innovasiyalar üzrə prorektor professor Asəf Zamanov və universitetin professor-müəllim heyəti iştirak edib.

Təqdimatı giriş sözü ilə açan ADPU-nun Elmi-Tədqiqat Mərkəzinin (ETM) müdiri dosent Ərəstun Mehdiyev tədbir iştirakçılarını salamlayıb, layihə və nümunəvi dərslər barədə məlumat verib. Ə.Mehdiyev qeyd edib ki, "Müasir təlim texnologiyalarına və beynəlxalq təcrübəyə əsaslanan yeni məzmunlu təhsilin ADPU-da tətbiqi" layihəsi ETM tərəfindən 2021-ci ildən həyata keçirilir. İlkin olaraq Tarix və coğrafiya və Filiologiya fakültələrində tətbiq edilən layihə sonrakı illərdə digər fakültələrdə də icra edilməyə başlanılıb. Layihə çərçivəsində beynəlxalq təcrübənin öyrənilməsi və tətbiqi, tədris prosesinə müasir yanaşmaların gətirilməsi məqsədilə müxtəlif araşdırmalar aparılıb, müzakirələr keçirilib, qabaqcıl təcrübələr və yeni dərs modelləri tətbiq edilib.

Elmi-Tədqiqat Mərkəzinin Tətbiqi tədqiqatlar bölməsinin müdiri dosent Gülşən Novruzova təqdimatın gedişi və təqdim ediləcək nümunəvi dərslər barədə iştirakçıları məlumatlandırıb. G.Novruzova qeyd edib ki, layihə çərçivəsində mütəmadi olaraq problem həlletmə, həyatla əlaqəli və situativ dərslər hazırlanır ki, bu dərslərdən bir neçəsi görüşün davamında iştirakçılar üçün təqdim ediləcək.



Daha sonra Ümumi tarix və tarixin tədrisi texnologiyası kafedrasının müəllimi Əliəşrəf Abdulrazaqov "Müstəmləkəçilik və qloballaşma tarixi fənninə giriş", İbtidai təhsilin pedaqogikası kafedrasının müəllimi Günel Məmmədova "Tərbiyə işində valideyn-övlad münasibətlərinin pedaqoji əsasları", Ümumi psixologiya kafedrasının müəllimi Gülər Məmmədova "Şəxsiyyətin ertələmə (təxirəsalma) effektinin psixoloji təhlili" mövzusunda nümunəvi dərs təqdim ediblər.

Təqdimatın sonunda nümayiş edilən nümunəvi dərslər müzakirəyə çıxarılıb, iştirakçıların fikir, irad və təklifləri dinlənilib.

## Bəkir Çobanzadənin 130 illiyi qeyd edilib





Dekabrın 10-da Filologiya fakültəsinin təşkilatçılığı ilə görkəmli ədəbiyyatşünas, şair Bəkir Çobanzadənin 130 illiyinə həsr olunmuş seminar keçirilib. Tədbirdə universitetin professor-müəllim heyəti, tələbələr, alim və ziyalılar iştirak ediblər.

Açılış nitqi ilə çıxış edən ADPU-nun Filologiya fakültəsinin dekanı dosent Könül Həsənova Bəkir Çobanzadənin Azərbaycan filologiyası və türkologiyasının inkişafında əvəzsiz xidmətlərindən bəhs edib. Dos. K.Həsənova Çobanzadənin elmi fəaliyyətinin və araşdırmalarının müasir elmi-tədqiqatlar üçün əhəmiyyətli mənbə olduğunu vurğulayıb.

Sonra Bəkir Çobanzadənin həyat və yaradıcılığını əks etdirən videoçarx nümayiş olunub.

Seminarda Azərbaycan Atatürk Mərkəzinin direktoru akademik Nizami Cəfərov məruzə ilə çıxış edib. Məruzədə Bəkir Çobanzadənin zəngin yaradıcılığı, türk dünyasının elmi və ədəbi irsinin araşdırılması baxımından həyata keçirdiyi işlər barədə geniş məlumat verilib, onun çoxcəhətli fəaliyyətinin Azərbaycan xalqının milli-mədəni yaddaşında xüsusi yer tutduğu qeyd edilib.

Seminarın davamında fakültənin Ədəbiyyat kafedrasının professoru Mahmud Allahmanlı, Müasir Azərbaycan dili kafedrasının professoru İbrahim Bayramov, Azərbaycan dilçiliyi kafedrasının müdiri professor Həcər Hüseynova, Azərbaycan dili və onun tədrisi texnologiyası kafedrasının müdiri dosent Həmzə Əliyev, Azərbaycan dilçiliyi kafedrasının müəllimi Fidan Yusifzadə çıxış edərək, şairin elmi-mədəni və ictimai fikrin formalaşmasında müstəsna xidmətlərindən bəhs ediblər.

Daha sonra seminar fakültənin nəzdində fəaliyyət göstərən "Meh" ədəbi dərnəyinin üzvlərinin çıxışları ilə davam edib.

# Ümummilli Lider Heydər Əliyevin xatirəsi anılıb

Dekabrın 11-də ADPU-nun Heydər Əliyev Mərkəzində Ulu Öndərin anım günü ilə əlaqədar tədbir keçirilib. Tədbirdən öncə Pedaqoji Universitetin rəhbərliyi, müvafiq struktur rəhbərləri və professor-müəllim heyəti Fəxri Xiyabanda Ümummilli Lider Heydər Əliyevin və Ulu Öndərin ömür-gün yoldaşı, görkəmli oftalmoloq-alim, akademik Zərifə xanım Əliyevanın əbədi xatirələrini yad edərək məzarları üzərinə gül dəstələri qoyublar. Eləcə də görkəmli dövlət xadimi Əziz Əliyev və tanınmış həkim-alim Tamerlan Əliyevin xatirələri yad olunub.

"Xalqa həsr olunmuş ömür" adlı tədbirdə universitet rəhbərliyi, fakültə dekanları, şöbə, mərkəz və kafedra müdirləri, professor-müəllim heyəti və tələbələr iştirak ediblər.

Heydər Əliyev Mərkəzinin əməkdaşı Tərlan Ağayevin moderatorluğu ilə baş tutan tədbir Ulu Öndərin və ölkəmizin suverenliyi, ərazi bütövlüyü uğrunda şəhid olmuş Vətən övladlarının xatirəsinin yad edilməsi ilə başlayıb. Ümummilli Liderlə vida mərasimdən görüntülər təqdim olunduqdan sonra ADPU-nun rektoru professor Cəfər Cəfərov çıxış edib. Rektor qeyd edib ki, hər bir xalqın tarixi onun yetirdiyi görkəmli şəxslərin fəaliyyəti ilə sıx bağlıdır. Tarix bəzən elə nəhəng simalar yetişdirir ki, xalq onları özünün idealı, iftixar mənbəyi, əbədi lideri kimi qəbul edir. Belə fenomenal şəxsiyyətlərdən biri də Heydər Əliyevdir. Heydər Əliyev elə nadir liderlərdəndir ki, öz ölkəsinə iki dəfə, bir-birindən köklü şəkildə fərqlənən iki sistem şəraitində uğurla rəhbərlik edib, hər iki dövrdə xalqın dərin hörmətini, etimadını və dəstəyini qazana bilib. Ulu Öndər istər Azərbaycanın rəhbəri olduğu, istərsə də Sovet İttifaqının ali rəhbərliyində təmsil olunduğu zaman ölkəmiz və xalqımız qarşısında elə müstəsna xidmətlər göstərib ki, 2003-cü ildə səhhəti kəskin şəkildə pisləşdikdən sonra keçirilən prezident seçkilərində seçicilərin dörddə üçündən çoxu məhz onun müəyyənləşdirdiyi siyasi kursun davamına səs verib. Bu gün Azərbaycan cənab İlham Əliyevin rəhbərliyi altında dinamik inkişaf edən, dünya birliyində xüsusi yeri olan, ərazi bütövlüyünü və suverenliyini tam bərpa etmiş nüfuzlu dövlət kimi tanınır. Sonra Ulu Öndərin həyat və fəaliyyətinə həsr olunmuş sənədli film nümayiş olunub. Heydər Əliyevin respublikamıza rəhbərliyinin birinci mərhələsi və Moskvadakı fəaliyyəti barədə çıxış





edən Azərbaycan tarixi kafedrasının baş müəllimi, t.ü.f.d. Elman Mirzəyev 1969-1987-ci illəri dirçəliş və tərəqqi dövrü kimi xarakterizə edib. Tədbirin növbəti hissəsində "Meh" ədəbi dərnəyinin üzvlərinin ifasında Zəlimxan Yaqubun "Mən azərbaycanlıyam" şeiri ədəbi-bədii kompozisiya şəklində təqdim olunub. Ümumi tarix və tarixin tədrisi texnologiyası kafedrasının dosenti, t.ü.f.d. Afaq Piriyevanın "Anarxiyadan sabitliyə, tənəzzüldən davamlı inkişafa aparan 10 il (1993-2003-cü illər)" mövzusunda çıxış edib.

Tədbir Ulu Öndərə həsr olunmuş mahnının dinlənilməsindən sonra ADPU Tələbə Gənclər Təşkilatının sədri Çiçək Sultanlının "Gənc nəslə diqqət və qayğı- Heydər Əliyevin çoxşaxəli fəaliyyətinin prioritet istiqamətlərindən biri kimi" mövzusundakı çıxışı ilə yekunlaşıb.

## Şamaxı filialında "Yaşıl dünya naminə: Elmi tədqiqatlar və təcrübələr" mövzusunda konfrans keçirilib



ADPU-nun Şamaxı filialında "Yaşıl dünya naminə həmrəylik ili" çərçivəsində filialın professor-müəllim heyətinin il ərzindəki elmi-tədqiqat işlərinin yekunlarına həsr olunmuş "Yaşıl dünya naminə: Elmi tədqiqatlar və təcrübələr" mövzusunda konfrans keçirilib.

Konfransın plenar iclasında filialın direktoru dosent Tünzalə Yusifova giriş sözü ilə çıxış edərək qeyd edib ki, konfrans 2024-cü ilin "Yaşıl dünya naminə həmrəylik ili" elan edilməsi haqqında ölkə Prezidenti İlham Əliyevin müvafiq Sərəncamına uyğun olaraq təşkil edilib. T.Yusifova Azərbaycanın 2030-cu ilə qədər sosial-iqtisadi inkişafa dair beş milli prioritetindən birinin "Təmiz ətraf mühit və yaşıl artım ölkəsi" kimi müəyyən edildiyini vurğulayaraq, ölkəmizdə ətraf mühitin sağlamlaşdırılması, yaşıllıqların bərpası və artırılması, su ehtiyatlarından və dayanıqlı enerji mənbələrindən səmərəli istifadənin təmin edilməsi istiqamətində köklü işlərin aparıldığını diqqətə çatdırıb. Direktor professor-müəllim heyətinin elmi-tədqiqat fəaliyyəti haqqında məlumat verib və konfransın işinə uğur arzulayıb. Plenar iclasın ardınca konfrans işini 4 bölmədə – "Sosial və xüsusi elmlər", "Pedaqogika və psixologiya elmləri", "Riyaziyyat, informatika və onların tədrisi texnologiyası elmləri", "Filologiyanın aktual problemləri" bölmələrində davam etdirib. Birinci bölmədə 14, ikinci bölmədə 6, üçüncü bölmədə 6, dördüncü bölmədə isə 10 mövzu olmaqla, bölmə iclaslarında, ümumilikdə 36 iş üzrə məruzələr dinlənilib və müzakirələr aparılıb.

## ADPU XXVII NASCO konfransında 15 doktorantla təmsil olunub



10-11 dekabr tarixlərində Sumqayıt Dövlət Universitetində Elm və Təhsil Nazirliyi (ETN) , Elm və Ali Təhsil üzrə Dövlət Agentliyi (EATDA) və Sumqayıt Dövlət Universitetinin (SDU) birgə təşkilatçılığı, "SOCAR Polymer" MMC-nin baş sponsorluğu, "bp" və "Nobel Energy" şirkətlərinin sponsorluğu ilə "Yaşıl dünya naminə həmrəylik ili"nə həsr edilmiş Doktorantların və Gənc Tədqiqatçıların XXVII Respublika Elmi Konfransı (NASCO XXVII) keçirilib.

Konfransın plenar iclasında ADPU-nun rektoru professor Cəfər Cəfərov, elm və innovasiyalar üzrə prorektoru professor Asəf Zamanov, Magistratura və doktorantura şöbəsinin müdiri siyasi elmlər üzrə fəlsəfə doktoru Rəşad Sadıqov, eləcə də universitetin 15 nəfər doktorant, dissertant və gənc tədqiqatçısı iştirak ediblər. Tədbirdən əvvəl konfrans iştirakçıları müstəqil dövlətimizin qurucusu, Ümummilli Lider Heydər Əliyevin xatirəsini dərin ehtiramla yad edib, Ulu Öndərin Sumqayıt şəhərində yerləşən abidəsi önünə gül dəstələri qoyublar.

Tədbirdə giriş nitqi ilə çıxış edən SDU-nun rektoru Rüfət Əzizov qonaqları və iştirakçıları salamlayıb, elm və təhsilin qarşılıqlı əlaqəsinin möhkəmləndirilməsi məqsədilə ölkəmizdə həyata keçirilən genişmiqyaslı islahatlardan danışıb və konfransla bağlı statistik məlumatları təqdim edib.

Elm və təhsil naziri Emin Əmrullayev çıxışında 27-ci dəfə təşkil olunan konfransın əhəmiyyətini yüksək qiymətləndirdiyini vurğulayaraq, bü cür tədbirlərin elm sahəsində uğurlu bir ənənə formalaşdırdığını və gənc alimlərə böyük imkanlar yaratdığını qeyd edib. Ölkəmizdə elm və təhsilin inkişafı istiqamətində bir sıra mühüm və uğurlu addımlar atıldığını qeyd edən Emin Əmrullayev bildirib ki, bu gün müasir təhsil infrastrukturunun yaradılması, universitetlərdə beynəlxalq əməkdaşlığın genişləndirilməsi və elmi-tədqiqat fəaliyyətlərinin gücləndirilməsi bu sahədəki əsas prioritetlərdəndir.

Rəsmi açılış mərasimindən sonra konfrans öz işini təbiət elmləri, İKT və mühəndislik, sosial-humanitar elmlər istiqamətləri üzrə bölmələrdə davam etdirilib. Qeyd edək ki, ADPU-da hazırda fəlsəfə doktorluğu və elmlər doktorluğu proqramları üzrə ümumilikdə 48 doktorant və dissertant təhsil alır. Yaşı 35-ə qədər olan doktorant, dissertant və gənc tədqiqatçıların sayı 32-dir ki, onlardan 15 nəfəri konfransda tezislə iştirak edib. Bu, ADPU-nun ənənəvi olaraq keçirilən Doktorantların və Gənc Tədqiqatçıların Respublika Elmi Konfransı (NASCO ) üzrə son illərdə əldə edilmiş ən yüksək göstəricidir. Konfransda tezisi qəbul edilmiş iştirakçıların sayına görə ADPU 44 ali təhsil müəssisəsi və elmi-tədqiqat institutları arasında 3-cü yerdə qərarlaşıb.

## Professor Mustafa Aydın ADPU-da təhsildə innovativ liderlikdən danışdı



Dekabrın 19-da Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Pedaqoji Universitet və Avrasiya Universitetlər Birliyinin (EURAS) birgə təşkilatçılığı ilə "Təhsildə İnnovativ Liderlik: Gələcəyin Təhsil Sistemini Qurmaq" mövzusunda seminar keçirilib. EURAS prezidenti, İstanbul Aydın Universitetinin qurucusu və Himayəçilər Şurasının rəhbəri professor Mustafa Aydının təqdimatında keçirilən seminarda təhsildə liderlik, innovativ yanaşmalar və uğurlu strategiyalar müzakirə olunub. Seminar iki hissədən ibarət olub. Prof. M.Aydın birinci hissədə təhsil mühitində diqqət yetirilməli olan əsas məqamlar, ikinci hissədə isə təhsildə dəyərlərin önəmi və tətbiqi mövzuları ətrafında fikir və təcrübələrini bölüşüb. Seminar zamanı təhsildə şəxsiyyətyönümlü yanaşmanın əhəmiyyəti və müəllimlərin liderlik roluna toxunularaq qeyd edilib ki, müasir müəllim yalnız bilik ötürücüsü deyil, həm də yol göstərəndir. Şəxsiyyət yetişdirməyə yönələn təhsil sistemində maraq mərkəzləri yaradılmalı, şagirdlərə sosial məsuliyyət və həssaslıq hissləri aşılanmalıdır. Prof. M. Aydın vurğulayıb ki, müəllim dərs prosesində lider kimi davranmalı, dərsini ssenari şəklində planlamalı və gəncləri mənfi təsirlərdən qoruyaraq onların potensialını üzə çıxarmalıdır. Təhsilin məqsədi yalnız bilik ötürmək deyil, həm də əldə edilən bilikləri praktik və sosial dəyərə çevirməkdir. Alim bəhs etdiyi yanaşmaların təhsil sahəsində innovativ liderliyin əsasını təşkil etdiyini bildirilib. Təhsil işçiləri, universitetin professor-müəllim heyəti və tələbələrin iştirak etdiyi seminarda maraqlı və interaktiv müzakirələr aparılıb, iştirakçıların sualları cavablandırılıb. Müzakirələrdə xüsusilə fərqlənən ADPU-nun tələbəsi Xədicə Əhmədliyə prof. Mustafa Aydın tərəfindən İstanbul Aydın Universitetində tam təqaüdlə magistratura və doktorantura təhsili hədiyyə olunub. Qeyd edək ki, tanınmış alim və təhsil mütəxəssisi olan prof. Mustafa Aydın Türkiyə ali təhsil sistemində bir çox reformlara öncüllük edib, o cümlədən hibrid ali təhsil modelini ilk dəfə tətbiq edərək beynəlxalq tələbələrin Türkiyəyə cəlb olunmalarında yeni səhifənin başlanğıcını qoyub. O, İstanbul Aydın Universiteti, Kipr Elm Universiteti, BİL holdinq, BİL kollecləri, BİL yayımları, Mustafa Aydın Vəqfi kimi bir çox təhsil qurumunun qurucusu və rəhbəridir.

# Kataliz və Qeyri-üzvi Kimya İnstitutu ilə əməkdaşlıq memorandumu imzalanıb

Dekabrın 12-də Pedaqoji Universitet ilə Elm və Təhsil Nazirliyinin akademik M.Nağıyev adına Kataliz və Qeyri-üzvi Kimya İnstitutu arasında əməkdaşlıq memorandumu imzalanıb. Memorandumu ADPU-nun rektoru professor Cəfər Cəfərov və Kataliz və Qeyri-üzvi Kimya İnstitutunun baş direktoru akademik Dilqəm Tağıyev imzalayıblar. Qarşılıqlı əməkdaşlıq elmi-tədqiqat və kadr hazırlığı sahəsində maddi-texniki baza və kadr potensialından birgə istifadə, tədris prosesinin elmi-tədqiqatla əlaqələndirilməsi, elm və təhsilin inteqrasiyasının gücləndirilməsi, müvafiq ixtisas sahələri üzrə birgə elmi əsərlərin çap edilməsi və digər məsələləri əhatə edir.

İmzalanma mərasimində ADPU-nun Kimya və biologiya fakültəsinin dekanı dos. Reyhan Ağayeva, dekan müavini dos. Bəsti Əsədova, Ümumi kimya və kimyanın tədris texnologiyası kafedrasının müdiri dos. Kəmalə İskəndərova, Analitik və üzvi kimya kafedrasının müdiri prof. Əli Zalov, Kataliz və Qeyri-üzvi Kimya İnstitutunun icraçı direktoru, AMEA-nın müxbir üzvü Məhəmməd Babanlı, institutun elmi katibi, baş elmi işçi Mina Münşiyeva, laboratoriya müdiri prof. Akif Əliyev, institutun təhsil şöbəsinin müdiri dos. Sevinc Məmmədova iştirak ediblər.

Sonda ADPU-nun rektoru prof. Cəfər Cəfərov Pedaqoji Universitetin 100 illiyinə həsr olunan universitetin tarixini və inkişaf yolunu əks etdirən yubiley nəşrlərini instituta hədiyyə edib. Eyni zamanda akademik Dilqəm Tağıyev institutun tarixi və tərəqqi yolu ilə bağlı kitabları prof. Cəfər Cəfərova təqdim edib.





## "ADPU SABAH 1" komandası Tələbələrin Beynəlxalq Proqramlaşdırma Müsabiqəsinin yarımfinal mərhələsində



13-15 dekabr 2024 - cü il tarixlərində Pedaqoji Universitetin SABAH qruplarının tələbələri Gürcüstanın paytaxtı Tbilisi şəhərində Gürcüstan Milli Universitetinin bazasında keçirilən "49-cu ICPC – Tələbələrin Beynəlxalq Proqramlaşdırma Müsabiqəsi"nin yarımfinal mərhələsində və Cənubi Qafqaz açıq çempionatında (komanda və fərdi) iştirak ediblər.

Qeyd edək ki, oktyabrın 13-də keçirilmiş müsabiqənin Azərbaycan üzrə təsnifat mərhələsində 23 ali təhsil müəssisəsindən ümumilikdə 174 komanda iştirak edib. İnnovasiya və Rəqəmsal İnkişaf Agentliyinin (İRİA) dəstəyi, Bakı Mühəndislik Universiteti və ADA Universitetinin təşkilatçılığı ilə 27 oktyabr tarixində Bakı Mühəndislik Universitetində keçirilmiş dörddə bir final mərhələsində (XX Azərbaycan Birinciliyi) 22 ali təhsil müəssisəsindən 51 komanda iştirak edib.

Müsabiqənin dörddə bir final mərhələsində komandalara 5 saat ərzində 14 alqoritmik məsələni C, C++, Java və ya Python proqramlaşdırma dillərində həll etmək tapşırığı verilib. Həllər avtomatik qiymətləndirmə sistemi ilə qiymətləndirilib.

Dörddə bir finalın nəticələrinə əsasəm ADPU-nun SABAH qrupları tələblərindən ibarət "ADPU SABAH 1" komandası (Yaqub Xəlilli, Röyal Adgözəlov, Fidan Həsənzadə, Etibar Seyidzadə (məşqçi) və Əlmusa Atamaliyev (həmməşqçi)) müəllimlik ixtisasları üzrə Azərbaycan və Cənubi Qafqazdan çempionatın yarımfinal mərhələsinə vəsiqə qazanan yeganə komanda olub.

# Pedaqoji Universitetdə II Təhsil Menecerləri Forumu keçirildi

Dekabrın 14-də Hədəf Şirkətlər Qrupunun təşkilatçılığı, Pedaqoji Universitetin ev sahibliyi ilə II Təhsil Menecerləri Forumu (TMF) keçirilib. 400-dən çox iştirakçının qatıldığı forumda təhsil sahəsində rəhbər vəzifə tutan şəxslər, mütəxəssislər və ictimaiyyət nümayəndələri iştirak ediblər. Forumun əsas mövzusu təhsildə idarəetmə, rəqəmsal transformasiya və ekoloji məsuliyyətin müzakirəsi olub. Açılış nitqi ilə çıxış edən Azərbaycan Dövlət Pedaqoji Universitetinin rektoru Cəfər Cəfərov vurğulayıb ki, biz bu gün təkcə təhsildəki dəyişiklikləri əks etdirmək üçün deyil, həm də gələcək nəsilləri qlobal vətəndaşlıq və milli inkişaf üçün zəruri olan bacarıq və dəyərlərlə təchiz etmək üçün innovativ yolları araşdırmaq üçün toplaşmışıq. Bizim qarşımızda tənqidi təfəkkür, innovasiya və ömür boyu öyrənməni təşviq edən bir sistem qurmaq dayanır. Bu sistem həm qlobal tendensiyalara, həm də xalqlarımızın mədəni mahiyyətinə uyğun olmalıdır.

Rektor qeyd edib ki, ənənə ilə innovasiyanı birləşdirərək fəaliyyətini davam etdirən Pedaqoji Universitet müasir təhsilin tələblərinə cavab vermək üçün transformativ proqramlar tətbiq edir. Belə təşəbbüslərdən biri də CVU ilə ikili diplom proqramıdır ki, bu da tələbələrimizə milli dəyərlərə bağlı qalmaqla yanaşı, beynəlxalq təcrübə əldə etmək üçün unikal imkan yaradır. Bundan əlavə, təhsilin təşkili və idarə olunması üzrə magistr proqramlarımız və təlimlərimiz təhsil sektorunda sistemli dəyişiklikləri həyata keçirə bilən liderlər yetişdirmək məqsədi daşıyır. Hazırda Pedaqoji Universitetin magistrantlarının 47,5 faizi sırf təhsilin, onun marketinqi, ali təhsilin, təlim və tədrisin təşkili və idarə olunması istiqamətində universitetdə magistr hazırlığı həyata keçirilən müvafiq ixtisaslaşmalar üzrə təhsil alır. Beləliklə, deyə bilərik ki, ADPU-da yeni məzmunlu magistr ixtisaslaşmalarımız, gələcək təhsil liderlərini hazırlamağa xidmət edir. Eləcə də universitetdə təhsilin idarə olunması sahəsində qeyri-formal təhsil istiqamətində də önəmli addımlar atılır. "Məktəb Liderliyi" Proqramı və "Məktəbəqədər Təhsildə Liderlik" Proqramı ADPU-nun bu sahədə innovativ yanaşmasının təməl daşlarıdır.




Prof. Cəfər Cəfərov sonda hər kəsi inklüziv, gələcəyə hesablanmış və cəmiyyətin ehtiyaclarına dərindən bağlı olan təhsil sistemini inkişaf etdirmək öhdəliyi üzərində düşünməyə, təhsilin dəyişikliklərə rəhbərlik etdiyi sistem qurmaq yolunda aktiv çalışmağa çağırıb.

Açılış mərasimində çıxış edənlərdən Hədəf Şirkətlər Qrupunun baş direktoru, TMF-nin layihə rəhbəri Şəmil Sadiq, Təhsilin İnkişafı Fondunun (TİF) sədri Elnur Nəsibov və Dövlət Gömrük Akademiyasının (DGA) sədri Qulu Novruzov forumun məqsədindən, təhsil sahəsinin qarşısında duran çağırışlar və bu istiqamətdə birgə əməkdaşlığın vacibliyindən söz açıblar.

Tədbirə qatılan xarici və yerli spikerlər, o cümlədən Türkiyənin Boğaziçi Universitetinin Təhsil fakültəsinin dekanı professor İrfan Ərdoğan, "Educo Group"un direktoru Ərcümənd Özayan, Qarabağ Universitetinin rektoru Şahin Bayramov, Sumqayıt Dövlət Universitetinin rektoru Rüfət Əzizov, Naxçıvan Dövlət Universitetinin rektoru Elbrus İsayev və başqaları panel müzakirələrində iştirak ediblər.

Forumda "Təcrübədə innovativ idarəetmə", "Təhsil idarəetməsində texnoloji və ekoloji məsuliyyətlər" və



"Məktəb idarəetməsində keyfiyyət təminatı" mövzularında panellər keçirilib. Panel iştirakçıları arasında təhsil sahəsindəki problemlər və onların həlli yolları geniş müzakirə edilib, praktik tövsiyələr verilib. Prof. İrfan Ərdoğanın "Təhsildə islahatlar", Ercümənd Özayanın "Rəqəmsal əsrdə innovativ öyrənmə metodları", Ulaş Nəzir və Mərd Doğanın "Təhsildə rəqəmsal inteqrasiya və məlumatların təhlili: Süni intellekt" mövzusunda çıxışları iştirakçılar tərəfindən böyük maraqla qarşılanıb.

Təhsil menecmenti sahəsində təcrübə mübadiləsi, yeni əlaqələrin qurulması və növbəti layihələr üçün zəmin yaradılması forumun əsas nailiyyətləri kimi yadda qalıb.

Qeyd edək ki, forumun media dəstəkçiləri Azərbaycan Televiziya və Radio Verilişləri QSC (AZTV) və "Səs" İnformasiya Agentliyidir. Tədbirin rəsmi tərəfdaşları Azərbaycan Respublikası Əmək və Əhalinin Sosial Müdafiəsi Nazirliyi, Dövlət Məşğulluq Agentliyi, Naxçıvan Dövlət Universiteti, tərəfdaşları MÜSİAD Azərbaycan, "ELTA", "XAN" nəşriyyatı, informasiya tərəfdaşları "Ustad" ədəbiyyat və sənət dərgisi, "azedu.az" və "sənət.az" saytları, sponsorları "iTech", "alba" və "SİNKOD" şirkətləridir.

Tiraj - 500
Şəhadətnamə - № 191

# GƏNC MÜƏLLİM QƏZETİ




## Quba filialında "Level UP" forumu çərçivəsində əmək yarmarkası keçirilib



27-29 noyabr tarixlərində Quba şəhərində ADPU-nun Quba filialı, Gənclərin İnkişaf və Karyera Mərkəzinin Quba-Xaçmaz regional nümayəndəliyi və Dövlət Məşğulluq Agentliyinin Quba-Xaçmaz Regional Məşğulluq filialının birgə təşkilatçılığı ilə "Level Up" karyera forumu keçirilib. 2 mərhələdən ibarət olan forumun I mərhələsində "Şəxsi inkişaf və karyera planlaması" mövzusunda panel müzakirə təşkil edilib. Müzakirələrdə ADPU-nun Quba filialının direktoru dosent Yusif Alıyev, Dövlət Məşğulluq Agentliyinin Mərkəzi Karyera filialının müdiri, beynəlxalq biznes sertifikatlı təlimçi Toğrul Ələkbərov, "Panda School" uşaq inkişaf mərkəzləri və "Ellin" MMC-nin təsisçisi Elvin Dadaşsoy, Azərbaycan Dövlət İqtisad Universitetinin nəzdində Sosial-İqtisadi Kollecinin direktoru, təhsil və karyera məsləhətçisi Şəhriyar Laçınov və Dövlət Məşğulluq Agentliyinin Mərkəzi Karyera filialının Xidmət inkişafı və innovasiyalar şöbəsinin müdiri, təlimçi Pərviz Əfəndizadə iştirak edib.

Panel müzakirədə "Qubadan dünyaya marafon", "Öz biznesinə başla", "İntizam - özünə etdiyin ən böyük yaxşılıq", "Karyerada davamlılıq" mövzuları ətrafında fikir mübadiləsi aparılıb. Çıxış edən ADPU-nun Quba filialının direktoru dos. Yusif Alıyev gənclərin şəxsi inkişaf və karyera planlaşdırılmalarının doğru istiqamətləndirilməsi baxımından forumun əhəmiyyətinin yüksək olduğunu qeyd edib. Y.Alıyev filialın hər zaman bu kimi inkişafyönümlü layihələrə dəstək göstərdiyini bildirib.

Forumun II mərhələsində ADPU-nun Quba filialında əmək yarmarkası təşkil edilib. Əmək yarmarkasında iştirakçılara rayonda fəaliyyət göstərən müxtəlif təşkilat, qurum və şirkətlər tərəfindən elan olunmuş vakansiyalar, təcrübə və könüllülük proqramları təklif edilib, mövcud vakansiyalar haqqında məlumatlar verilib. Gənclər sərgi stendlərinə yaxınlaşaraq vakansiya müraciəti etmək, vakansiyalar haqqında ətraflı məlumat almaq və suallarına cavab almaq şansı əldə ediblər.

## Bartın Universitetinin nümayəndələri ADPU-da olub



Dekabrın 2-də Türkiyənin Bartın Universitetinin (BARU) prorektoru professor Mehmet Zahmaqıran, rektorun şəxsi katibi Turqay Delialioğlu, Erasmus Ofisinin koordinatoru Əhməd Yirmibeş və əlaqə koordinatoru Murad Ceylan ADPU-nu ziyarət ediblər.

Görüşdə ADPU-nu tədris işlər üzrə prorektor dosent Eldar Aslanov və Beynəlxalq əlaqələr şöbəsinin müdiri Günay Məhərrəmova təmsil ediblər. Görüş zamanı tərəflər arasında ikitərəfli əməkdaşlıq imkanlarının genişləndirilməsi məsələləri müzakirə olunub.

## "İnklüziv təhsil üçün daimi peşəkar inkişaf" mövzusunda interaktiv seminar



ADPU TKTB SABAH qrupları təşkilatının təşkilatçılığı ilə 3 Dekabr – Beynəlxalq Əlillər Gününə həsr olunmuş "İnklüziv təhsil üçün daimi peşəkar inkişaf" layihəsi həyata keçirilib. Layihə çərçivəsində təşkil edilmiş interaktiv seminarda ADPU-nun İbtidai təhsilin pedaqogikası kafedrasının baş müəllimi, pedaqogika üzrə fəlsəfə doktoru Gülşən Eminova "İnklüziv siniflərdə müxtəlif təlim üsulları", "Təqdimat və çıxış bacarıqlarının formalaşdırılması", "İnklüziv siniflərdə bədən dilinin planlaşdırılması" mövzularında təqdimatla çıxış edib. Seminarın ikinci hissəsində tələbələr qruplar şəklində praktik tapşırıqlar icra edərək, təlimdən əldə etdikləri nəzəri bilikləri əyani olaraq tətbiq ediblər.

Tələbələr tərəfindən böyük maraqla qarşılanan seminarın son mərhələsində icra edilən tapşırıqların nəticələri dəyərləndirilib, iştirakçıları maraqlandıran suallar cavablandırılıb.

## IQAinAR layihəsinin yekun konfransı keçirilib



Dekabrın 4-də ADPU-da Avropa Komissiyası tərəfindən maliyyələşdirilən "Azərbaycan Respublikası və Rusiyada ali təhsil müəssisələrində tədris, öyrənmə və qiymətləndirmə sahəsində təhsilin daxili keyfiyyət təminatının gücləndirilməsi (IQAinAR)" layihəsinin yekun konfransı keçirilib.

Konfransda Azərbaycan Respublikasının elm və təhsil nazirinin müşaviri Nicat Məmmədli, ADPU-nun rektoru professor Cəfər Cəfərov, beynəlxalq əlaqələr üzrə prorektor professor Mahirə Hüseynova, Milli Erasmus Ofisinin direktoru Pərviz Bağırov, IQAinAR layihəsinin koordinatoru olan Niderlandın Vittenborq Tətbiqi Elmlər Universiteti (WUAS), digər iştirakçıları – Niderlandın "415 International BV" təşkilatı və İspaniyanın Müqəddəs Entoni Katolik Universitetinin (UCAM) nümayəndələri iştirak ediblər.

Xarici nümayəndələrlə yanaşı, konfransda Naxçıvan Dövlət Universiteti, Azərbaycan Texniki Universiteti, Bakı Mühəndislik Universiteti, Azərbaycan Memarlıq və İnşaat Universiteti, Bakı Ali Neft Məktəbi, Azərbaycan Dövlət Mədəniyyət və İncəsənət Universiteti, Dövlət Gömrük Komitəsinin Akademiyası, Azərbaycan Dövlət Aqrar Universiteti, Sumqayıt Dövlət Universiteti, Bakı Slavyan Universiteti, Azərbaycan Tibb Universiteti, Bakı Biznes Universiteti, Bakı Avrasiya Universiteti, Azərbaycan Dövlət İqtisad Universiteti, Azərbaycan Turizm və Menecment Universiteti, Azərbaycan İdman Akademiyası, Azərbaycan Dillər Universiteti, Dövlət İdarəçilik Akademiyası, Xəzər Universiteti, Qarabağ Universiteti, Lənkəran Dövlət Universiteti, Azərbaycan Dövlət Neft və Sənaye Universiteti və Bakı Dövlət Universitetinin Keyfiyyət təminatı və Beynəlxalq əlaqələr şöbəsinin əməkdaşları da iştirak ediblər.

Giriş sözü ilə çıxış edən ADPU-nun rektoru professor Cəfər Cəfərov layihənin əhəmiyyəti barədə danışıb, təhsil sahəsində beynəlxalq təcrübə mübadiləsi və qlobal tendensiyaların inteqrasiyası baxımından bu kimi layihələrin vacibliyini vurğulayıb. Rektor diqqətə çatdırıb ki, Pedaqoji Universitet beynəlxalq əməkdaşlıq çərçivəsində həyata keçirilən faydalı layihələrdə iştiraka maraqlı tərəfdir və bu cür nüfuzlu layihənin yekun konfransının ADPU-da keçirilməsi sevindirici haldır.

Azərbaycan Respublikasının elm və təhsil nazirinin müşaviri Nicat Məmmədli, Milli Erasmus Ofisinin direktoru Pərviz Bağırov və layihənin koordinatoru olan Niderlandın Vittenborq Tətbiqi Elmlər Universitetinin (WUAS) nümayəndəsi Xin (Maggie) Feng çıxış edərək, layihənin nəticələri və əldə olunan uğurlar haqqında məlumat veriblər.

Konfrans çərçivəsində layihənin əldə etdiyi nəticələrə dair müzakirələr aparılıb. Tədbir təhsilin keyfiyyət təminatı sahəsində milli və beynəlxalq əməkdaşlığın inkişafında yeni imkanlar açmaq baxımından əhəmiyyətli rol oynayıb.

## BAŞSAĞLIĞI

**Azərbaycan Dövlət Pedaqoji Universitetinin rəhbərliyi və professor-müəllim heyəti adından mərhum əməkdaşlarımız və tələbəmizin yaxınlarına dərin hüznlə başsağlığı verirk!**

**Allah rəhmət eləsin!**



Nərminə Həsənova
Biologiya və onun tədrisi texnologiyası kafedrasının laboratoriya müdiri



Məhsəti Məmmədova
Təsviri incəsənət və onun tədrisi texnologiyası kafedrasının müəllimi



Allahyar İmanov
İbtidai təhsilin pedaqogikası kafedrasının dosenti



Həqiqət Məmmədova
Filologiya fakültəsinin Xarici Dillər Mərkəzinin baş müəllimi



Ləman Osmanova
Quba filialının Coğrafiya müəllimliyi ixtisasının III tədris ili tələbəsi


## Redaksiya heyəti


Professor Cəfər Cəfərov
Müşahidə şurasının sədri


Dosent Eldar Aslanov
Müşahidə şurasının üzvü


Professor Asəf Zamanov
Müşahidə Şurasının üzvü


Professor Fikrət Rzayev
Müşahidə Şurasının üzvü


Professor Mahirə Hüseynova
Müşahidə Şurasının üzvü


Könül Pirverdiyeva
Müşahidə Şurasının üzvü


Tural Cəlilov
Müşahidə Şurasının üzvü


Taleh Mirzəyev
Redaktor


Məhəmməd İsrayılzadə
Redaktor


Nurlan Səmədov
Fotoqraf


Elvin Vahidov
Dizayner

Fotolar Nurlan Səmədovundur. Qəzet "Gənc Müəllim" qəzetinin redaksiyasında yığılıb, səhifələnib və "Azərbaycan Nəşriyyatı" MMC-də çap olunub. Sifariş №: 3031

Ünvan: Bakı şəhəri, Səbail rayonu, Ü.Hacıbəyli küçəsi, 68 / Əlaqə: +994 50 868 08 33 / Qəzetdə qeyd edilən faktlara görə redaksiya məsuliyyət daşımır.